DOI: 10.36719/2706-6185/03/5-22

**Əli Umud oğlu Əliyev**
Azərbaycan Dövlət Pedaqoji Universiteti Ağcabədi filialı
filologiya üzrə fəlsəfə doktoru
eli.eliyev.54@mail.ru

# QƏDİM TÜRK, ŞUMER VƏ QAFQAZ ALBANİYASININ İZLƏRİNİ ÖZÜNDƏ ƏKS ETDİRƏN TOPONİMLƏR AZƏRBAYCANIN ETNİK TARİXİDİR

**Xülasə**

Eramızdan əvvəl I minilliyin əvvəllərindən eramızın VIII-XII əsrlərinə qədər olan dövrü əhatə edən Azərbaycan xalqının etnogenetik prosesinin formalaşması kimi mühüm məsələlərin müqayisəli şəkildə tədqiqi xalqımızın etnogenezi baxımından aktual məsələdir. Azərbaycanda qədim zamanlardan etibarən multikultural mühit formalaşmışdır.

Tarixi faktlardan biri də budur ki, etnoslar yaşadıqları əraziləri öz etnik adları ilə adlandırmaqla tarixə toponimlər həkk etmişlər. Odur ki, müasir dövrdə Azərbaycan ərazisində qədim türk, şumer və alban etnoslarının etnik adlarına rast gəlinməsi bu yerlərin əcdadlarımıza məxsus olduğuna sübutdur. Bu tədqiqatın yazılma səbəbi bu sahədə olan boşluğu doldurmaq və Azərbaycanın vərəsəliyə malik olduğunu bir daha diqqətə çatdırmaq ideyasıdır.

***Açar sözlər:*** *qədim türklər, Qafqaz Albaniyası, şumerlər, qədim toponimlər, etnik tarix*






**Ali Umud Aliyev**
Azerbaijan State Pedagogical University Aghjabadi branch
PhD in Philology
eli.eliyev.54@mail.ru

# Toponyms with traces of ancient Turkish, Sumar, and Caucasian Albania are the ethnic history of Azerbaijan

## Abstract

The comparative study of such important issues as the formation of the ethnogenetic process of the Azerbaijani people, covering the period from the beginning of the first millennium BC to the VIII-XII centuries AD, is a topical issue in terms of the ethnogenesis of our nation. A multicultural environment has been formed in Azerbaijan since ancient times.

One of the historical facts is that ethnoses engraved toponyms in history by naming the areas inhabited by them by their ethnic names. Therefore, the fact that the ethnic names of the ancient Turkic, Sumerian and Albanian ethnoses are found in the territory of Azerbaijan in modern times is evidence that these places belong to our ancestors. The reason for writing this study is to fill the gap in this field and to draw attention to the fact that Azerbaijan has a legacy.
***Keywords:*** *ancient turks, Caucasian Albania, Sumerians, ancient toponyms, ethnic history*

## Giriş

Ölkəmiz müstəqillik qazandıqdan sonra xalqımızın öz kökünə, soyuna artan marağı bu mövzuda çoxlu elmi araşdırmalara səbəb olmuşdur. Odur ki, Azərbaycanın ulu keçmişi olan əski türklərin, şumerlərin, Qafqaz albanlarının tarixinin, mədəniyyətinin dərindən öyrənilməsi, Azərbaycan xalqının etnogenetik prosesinin təşəkkülü, formalaşması, zaman etibarilə bu prosesin böyük bir tarixi dövrü-eradan əvvəl I minilliyin əvvəllərindən bizim eranın VIII-XII əsrlərinə qədərki dövrü əhatə etməsi kimi öndə məsələlərin müqayisəli şəkildə araşdırılması xalqımızın etnogenezi baxımından aktual bir mövzudur.

Bu mövzunun aktuallığının ikinci tərəfində son dövrün olayları dayanır. Çünki yaxın otuz ildə baş verənlər, erməni uydurmaları tarixi reallığın ortaya qoyulmasını, müxtəlif istiqamətli araşdırmaların aparılmasını zəruri edir. İctimai- siyasi, etnoqrafik, tarixi, ədəbi materialların, faktların aşkarlanmasına indi yeni səpkidə yanaşma daha vacib və daha zəruridir. Odur ki, toponimlərimizin yeni yanaşma metodu ilə hərtərəfli öyrənilməsi bir sıra qaranlıq və gizli qalan amillərin aşkarlanması deməkdir. Buna görə də 2016-cı ildə Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun "Qafqaz Albaniyasının intibahı" layihəsinin həyata keçirilməsi aktual bir məsələnin bünövrəsinin qoyulması deməkdir.

Bu araşdırmanın predmeti Azərbaycan xalqının etnogenetik formalaşmasında birbaşa təsiri olan türk tayfalarının spesifikasını, ayrı-ayrı türksoylu nəsillərin izlərini əks etdirən toponimlərin, dil faktlarının müqayisəli müstəvidə araşdırılmasını şərtləndirir. Bu məqsədlə Azərbaycanın ulu keçmişi, Qafqaz Albaniyasının izləri və sözlərini dərindən araşdırmaq və öyrənmək üçün Qafqaz Albaniyasının sərhədlərini dəqiqləşdirmək, albanların Azərbaycan türkünün etnik soyunu şərtləndirən amilləri ortaya qoymaq, regionlar üzrə (Laçın, Kəlbəcər, Şəmkir, Tovuz, Bərdə, Gəncə, Qəbələ, Qax, Şəki, Oğuz, Zakatala, Balakən, Ağcabədi, Ağdam, Beyləqan və s.) qədim Türk, Şumer, Qafqaz Albaniyasının izlərini özündə əks etdirən toponimlərin leksik anlamını aydınlaşdırmaq, dil faktlarını Şumer, Alban, Azərbaycan türk dillərinin paralelliyi əsasında şərh etməklə xalqımızın milli etnik soyunun kumliyini və bu soyun yayılma arealını, məskunlaşdığı ərazilərin həmin soya məxsus olmasını bir daha aşkarlamaqdır.

Bu tədqiqatın yazılma səbəbi bu sahədə olan boşluğu doldurmaq və Azərbaycanın vərəsəliyə malik olduğunu bir daha diqqətə çatdırmaq ideyasıdır. Bu sahədə ikinci bir səbəb isə Qiyasəddin Qeybullayevin "Azərbaycan türklərinin təşəkkülü tarixindən" kitabının mənə stimul verdiyi aşağıdakı qiymətli reallıq və doğru həqiqətlərdir:

"Ali məktəblərdə türk xalqlarının tarixi kursunun tədrisində qondarma, dolaşıq konsepsiyalar əvəzinə problem məhz bu aspektə qoyulmalıdır. Tələbələr bilməlidirlər ki, türk xalqlarının tarixi bəşər tarixinin, Azərbaycan xalqının tarixi isə ümumtürk tarixinin ən qədim və ən zəngin hissəsidir; çünki

qədim türklərin ilk dövlət qurumları məhz Azərbaycan ərazisində yaranmışdır. Türk etnoslarının qədim dövrdə və erkən orta əsrlərdə Azərbaycan ərazisində Manna və Maday (e.ə. VIII-VI əsrlər), Sak çarlığı (e.ə. VII-V əsrlər), Atropatena (e.ə. IV-eranın III əsrləri), Albaniya (e.ə. IV-eranın VII əsrləri), Cənub-Şərqi Avropada Skif çarlığı (e.ə. VII-III əsrlər), Sarmat çarlığı (e.ə. III-eranın III əsrləri), Hun xaqanlığı (III-V əsrlər), Avar, Bolqar və Xəzər xaqanları (VI-IX əsrlər), Mərkəzi Asiyada və Orta Asiyada Hun xaqanlığı (e.ə. III-I əsrlər), Kuşan çarlığı (I-IV əsrlər), Aqhun (Eftalit) çarlığı (IV-VI əsrlər), Türk xaqanları (VI-VIII əsrlər) və b. çoxlu dövlət qurumları vardır. Sonrakı əsrlərdə türk dövlət qurumları daha çoxdur.

Mannalar, madaylar, atropatenlilər və albanlar haqqında irihəcmli kitablar çap olunmuşdur. Lakin bu kitabların heç biri xalqımızın mənşəyi məsələsində azərbaycanlıda milli iftixar hissi, milli qürur hissi, ümumiyyətlə, xoş emosiya yaratmır, çünki göstərilən etnosların etnik və dilcə mənsubiyyətləri haqqında həmin kitablarda deyilənlər xalqın ruhuna tamamilə ziddir. Azərbaycanlıları öz köklərindən ayırdıqlarına, onların etnogenezini tamamilə yad məcraya saldıqlarına və beləliklə, xalqımızın etnik tarixini cılızlaşdırdıqlarına görə bəzi tarixçilərimizin günahlarını əvvəl-axır xalq üzlərinə çırpacaqdır. Beləəri bulaq üstündəki quru ağaclara bənzəyirlər. Belə ağacların kölgəsi olmaz” (Qeybullayev, 1994: 239-240).

Bu tədqiqatın yeniliyi araşdırma predmetinin yeni dövrə uyğun inkişaf etdirilməsi aspektlərinin müəyyənləşdirilməsi və faktların aşkarlanmasına yeni səpkidə yanaşmadır.

Metodiki baxımdan bu məlumatlardan tarix və filologiya fakültəsinin tələbələri və bütün Azərbaycansevər vətənpərvərlər yararlana bilərlər.

Tədqiqat giriş, bir fəsil, nəticə və istifadə olunmuş ədəbiyyat siyahısından ibarətdir.

## Regionlar üzrə (Şəmkir, Kəlbəcər, Tovuz, Gəncə, Qəbələ, Qax, Şəki, Zaqatala, Balakən, Oğuz, Ağdam, Beyləqan) qədim Türk, Şumer və Qafqaz Albaniyasının izlərini özündə əks etdirən toponimlər

Azərbaycan məkanında qədim dövrlərdən çoxlu sayda etnoslar məskən salmış, yaşamışlar. Belə bir durum Azərbaycan xalqının gücünü, tolerantlığını, multikultural dəyərə malik olmasını şərtləndirir. Bu etnosları ideya məfkurə cəhətdən birləşdirən cəhət onların vahid məkanda yaşamaları və çoxunun türk kökünə bağlılığıdır. Yəni bu etnoslar müxtəlif adlarla bəlli olsalar da türksoylu olmuşlar. Türksoylu qədim nəsillərə alban, qarqar, sak, kəngər, çul, beçeneq, suvar, bulqar, hun, xəzər, dondar, qaytaq, kayı, bayat, alkar evli, kara evli, yazır, dögər, dodurğa, yaparlı, avşar, kızık, biqdeli, karkin, bayandur, beçənə, çavuldur, çipni, salur, eymur, alayuntlu, üregir, iğdır, bükdüz, yıva və kınıkları misal göstərə bilərik. Bu nəsillərin adları bu gün Azərbaycan məkanının hər bir guşəsinin leksik naxışını təşkil edir. Hər bir regionun onomastikasında türk soyları öz izlərini qoymuşdur. Odur ki, ayrı-ayrı regionlar üzrə türk soylarını yaşadan toponimlərə nəzər salaq:

**Şəmkir** rayonu ərazisində də türksoylu qədim sakinlərin izlərini yaşadan toponimlər onlarcadır. Bu toponimlərdən bir neçəsinə diqqət yetirək.

Şəmkir adı mənbələrdən bəlli olduğu kimi XI əsrdən əvvəl mövcud olmuşdur. Şəmkir sözünü tədqiqatçı alim İlhami Cəfərsoy belə izah edir: “X əsr abidəsi “Hüdud əl-aləm”də Azərbaycandakı Şəmkir şəhərinin adı Şəmkir kimi göstərilir. N.A.Baskakov belə hesab edir ki, Samker Xəzər boylarından biridir” (Cəfərsoy, 2010: 221).

Nazim Tapdıqoğlu isə “Şəmkir rayonu və onun toponimiyası” kitabında belə şərh verir: “Şəmkir sözünü Şəmkir etnotoponimi ilə də bağlayan tədqiqatçılar var. Tarixdən bəllidir ki, miladdan öncə VIII-VII əsrlərdə Ön Asiyaya soxulmuş skiflərin müəyyən bir qismi Azərbaycanda məskunlaşmışdılar. Şəmkir şəhəri ərazisi də həmin skif-sakların yaşadığı tarixi Sakasena {Şakaşen əyalətində yerləşmişdir. Onların tərkibində Azərbaycana gəlmiş tayfalardan biri də uqor-fin mənşəli saamlar (mənbəələrdə lopar kimi də adları çəkilir} olmuşlar. Guya şəm komponenti də onların adını əks etdirir. S-Ş səs əvəzlənməsi də məlum qrammatik hadisədir, bu yozumda isə toponim “saamların çayı” anlamındadır”. (Tapdıqoğlu, 2005: 362).

Hər iki sitatdan göründüyü kimi Şəmkir adı etnosla bağlı izah olunmuşdur. Həqiqətən də Şəmkir adı sam tayfalarının bu ərazidə məskunlaşması ilə bağlı yaranmışdır ki, bu tayfa da qədim türk tayfası olmuşdur. Davamlı olaraq Şəmkir ərazisində türksoylu qədim yerli sakinlərin adlarını yaşadan toponimlər geniş yayılmışdır:

Bayan dağı – bayan türk tayfasının adını əks etdirir.
Bodurlu qışlağı – bodurlu tayfasının adını yaşadır.
Bozdu tirəsi yeri – bozlu tayfasının adını yaşadır.
Cəyir çayı – cəyirli türk tayfası (çakurlu)
Çaparlı kəndi – çaparlı oğuz və türkmən tayfalarından biri olmuşdur.
Düyərli kəndi – oğuzların düyərli tayfasının adını daşıyır.
Keçili kəndi – oğuzların keçili tayfası.
Qapaqlı yeri – peçeneqlərin qapak tayfası.
Qarabağlar kəndi – Türkdilli qara baklar tayfası kəngər peçeneqlərə aid tayfadır.
Tatarlı kəndi – Türkdilli tatar tayfası.
Tumaslı tap – Tumaslı tayfası.
Zəyəm çayı, qəsəbəsi – Sax (zak) zəy tayfasının adı ilə bağlıdır.

Yuxarıda qeyd olunmuş toponimlər Şəmkir rayonunun qədim yaşayış məskəni olduğunu əks etdirir. Belə toponimlər Şəmkir ərazisində yüzlərlədir. "Gəncə-Qarabağ əyalətinin müfəssəl dəftəri" kitabında "Şəmkürbasan nahiyəsinə tabe olan kəndlər" bölümündə qədim türk tayfalarının adını yaşadan toponimlər onlarcadır. Məsələn, Məfruzlu kəndi, Qavallar kəndi, Kordilək kəndi, Kotançı kəndi, Dədəli kəndi, Xılxına kəndi, Alpağud kəndi, Keçili kəndi, Oxçulu kəndi, Çadırçı kəndi və s. (Gəncə-Qarabağ əyalətinin müfəssəl dəftəri, 2000: 79-123). Bütün bunlar Şəmkir rayonunun qədim Oğuz yurdu, Türk diyarı olduğunu bir daha təsdiq edən onomastik vahidlərdir.

**Kəlbəcər** rayonu da Türk Alban yurdu, Oğuz diyarıdır, qədim Türk uluslarının yaşayış məskənidir. Kəlbəcər həm də strateji əhəmiyyətə malik olan bir diyardır. Kəlbəcər də erməni hay braqilərin işğalı altında olmuşdur. Kəlbəcər və eləcə də Azərbaycanın 20% torpaqları təkcə maddi cəhətdən işğal olunmamışdır, mənəvi cəhətdən də işğal olunmaqla bütün yer-yurd adlarımız erməniləşdirilmişdir. Odur ki, bu gün qədim tarixi yer-yurd adlarımızın diqqətdə saxlanılması ən aktual məsələlərdəndir. Bu adlarda Azərbaycan türk millətinin tarixi salnaməsi, etnik soykökünün vəsiqəsi, sərhədlərinin daşlaşmış eksponat yaddaşı əks olunmuşdur. Tarixin yaddaş salnaməsini vərəqlədikcə məlum olur ki, tarixən Azərbaycanın 410 min kv.km. olan ərazisini məkrli düşmənlər zaman-zaman qayçılamış və hazırda 86 min kv.km. ərazimiz qalmışdır. Nə qədər dəhşətli olsa da, reallıq belədir.

Kəlbəcər haqqında "Bəzi tədqiqatçılar oykonimin ilkin variantının Kevliçer olduğunu güman edir və onu qədim türk dillərində "çay üstündə qala" (kevli- "çayın üstü" və çer/car – "qala") kimi izah edirlər" (Azərbaycan toponimlərinin ensklopedik lüğəti, 2007: 272). Bəzi tədqiqatçılar isə "mağaralı yarğan", bəziləri isə "çay ağzının əks tərəfi" kimi anlamda olduğunu iddia edirlər. Həmçinin əvvəllər Kəbləcər adlandığını sonralar isə Kəlbəcər kimi formlaşması da göstərilir. Kəlbəcərin qədim türk uluslarının yaşayış məskəni olduğunu sübuta yetirən onomastik vahidlər sırasında Ağcakənd, Aşağı xaç, Şurtan, Başlıbel, Birinci Milli, Boyur, Bozlu, Çəpli, Çərəktar, Çıldıran, Çıraq, Əsrik, Keşdək, Kolatağ, Qanlıkənd, Mişni, Tirkeşəvənd, Yanşaq, Zardaxaç və s. yer-yurd adlarını qeyd edə bilərik.

Hər hansı yer-yurd adının bir neçə ərazidə mövcud olması onu şərtləndirir ki, bu onomastik vahid etnik səciyyə daşıyır, yəni hər hansısa etnosla bağlıdır. Belə bir qanunauyğunluğa dirsəklənib deyə bilərik ki, Laçın rayonunda qeyd olunmuş qədim türk adlarını özündə əks etdirən onomastik vahidlər eyni ilə Kəlbəcərdə də mövcuddur. Bu ondan irəli gəlir ki, vaxtilə Laçın rayonundan köçüb, Kəlbəcərdə məskunlaşıb, yurd-yuva quranlar yaşadıqları məkanı da öz nəsil adları ilə adlandırmaqla türk soylu etnik adları müştərəkləşdirmişlər. Belə adlara Ağcakənd, Ağqaya, Alxaslı, Çorman, Qaraçanlı, Laçın, Mişni, Narınclar, Seyidlər və s. toponimləri misal göstərmək olar.

Ağcakənd kəndinin adına Laçın, Xocavənd və Goranboy rayonlarında da rast gəlirik. Bu isə o, deməkdir ki, Ağca etnosu məskunlaşdığı əraziləri tayfanın adı ilə adlandırmışlar. Ağcabədi, Ağcayazı, Ağcaqala və s. adlar da Ağca etnosu ilə bağlıdır. "Kitabi-Dədə Qorqud" dastanında Ağcaqala yer adının qeyd olunması Ağca tayfasının bu yerlərdə məskunlaşdığının və qədim dövrlərlə səsləşdiyinin şahidi oluruq. Ağca adlı qadın və Ağcayev soyadlı şəxslər Qarabağda bu gün də vardır.

Kəlbəcər rayonunda Aşağı Xaç, Zardaxaç adlarının qeydə alınması bu diyarın daha qədim dövrlərdən soraq verməsinə bir dəlildir. "Xaç əslində xristianlığın deyil, atəşpərəstliyin simvolu əsasında yaranmışdır. Müasir dövrdəki svastika atəşpərəstlərin bəşəriyyətə bəxş etdiyi simvoldur.

Bu faşist svastikasından fərqli olaraq xaç qollarının tərs istiqamətə yönəlməsi ilə seçilir. Atəşpərəstliyin simvolu xeyir başlanğıcını bildirirdi. Xristianlar bu simvolun uclarında istiqmətlənmiş xətt parçalarını götürüb xristianlığın simvolunu yaratmış, lakin bu barədə susaraq, xaçın çarmıx əsasında yarandığını iddia edirlər. Əslində isə bu quruluş, forma atəşpərəstlikdən qalmadır. Fasitlər atəşpərəstliyin simvolundan xeyir başlanğıcını bildirən istiqaməti tərsi ilə əvəz edərək onu şər başlanğıcı istiqamətinə yönəltmiş və bunu özlərinə simvol seçmişlər. Atəşpərəstliyin rəmzi həm də günəşlə bağlıdır. Kəlbəcər ərazisində qədim dövrlərdə yaşamış şəxslərin günəşə sitayiş etməsi ilə bağlı qədim qayaüstü təsvirlər də bu faktı təsdiq edir" (İsmayılov, 2012: 107). Tədqiqatçı alim Əjdər Fərzəli "Dədə Qorqud yurdu" kitabında geniş və ətraflı izahatla sübut etmişdir ki, xaç oddur, ocaqdır. "Xaç – od nişanı! Bütöv oddur" (Musayev, Mirzəyev, 2004: 88). Xaç sözünün odla bağlılığı bu işarənin daha qədim, atəşpərəstlik dövrü ilə səsləşdiyini deməyə imkan verir. Kəlbəcərdə Ağca türk tayfasının məskən salması nəticəsində Ağcakənd toponimi, Ayrım türk tayfası əsasında Aşağı və Yuxarı Ayrım toponimlərini, Bel tayfası – başlıbeli, mil tayfası – Birinci və İkinci Milli toponimlərini, Çəpni tayfası – Çəpli toponimini, Sak nəslindən olan Sorak tayfası – Çırak toponimini Keş/Kiş Şümer dövründən gələn qədim türk tayfasının məskunlaşması ilə yaranan Keşdək toponimi, Kanalı türk tayfası – Qanlıkənd toponimi, Qılıc türk tayfası – Qılıçlı toponimi, qədim türk mənşəli Tirkəş tayfası – Tirkeşəvənd toponimini yaratmışdır. Adları toponimlərdə yaşayan bu qədim türk tayfaları (Ağca, Ayrım, Bel, Mil, Çəpni, Sirak, Keş, Kanqlı, Qılıc, Türkeş və s.) Kəlbəcər rayonunun həm qədim yaşayış məskəni olduğunu, həmçinin bu diyarın yerli sakinlərinin türksoylu olduğunu sübut edən həyat vəsiqəsidir.

Moisey Kalankatuklunun "Albaniya tarixi" əsərində qeyd olunan onomastik vahidlərin izləri regionlar üzrə bu gün də qalmaqdadır. Məsələn;

Gis------Şəkidə Kiş kəndi, Kiş çayı, Laçında Kiş (Keş) dağı, Zorkeş kəndi, Qarakeş kəndi.

Qarqar çölü -----Mil düzüdür.

Paytakaran (Balasakan) ---İndiki Beyləqandır.

Çola keçidi------ Dərbənd keçididir.

Kür çayı-------Kür çayıdır.

Xəzər dənizi ----Xəzər dənizidir.

Qarqar çayı ---- Qarqar çayıdır.

Bərdə-----Bərdə

Qəbələ -- Qəbələ

Göqçay--- Göyçay

Şəki-----Şəki

Əcəri, Eceri, Heceri--- Ucar v. s.



**Şəki, Kiş məbədi**




Qədim mənbələrdə də ilk Alban kilsəsinin Kiş kəndində (Gis) tikilməsi haqqında məlumatlar var. Musa Kalankatuklunun verdiyi məlumata əsasən Albaniyada erkən xristian cəmiyyətinin yaranması apostollar Faddey, Yelisey, Varfolomeyin adları ilə bağlıdır.

**Ağoğlan məbədi**

**V-VI** əsrlərə aid Alban monastırı olan "Ağoğlan məbədi" Laçın rayonu ərazisində, Ağoğlan çayının sahilində yerləşir.

Əvvəllər məbədin qəsr kimi tanınması rəvayətlərdə öz əksini tapmışdır. Rəvayət edilir ki, bu ərazidən keçən gənc bir səyyah təbiətin gözəlliyinə heyran olmuş və burada qəsr tikdirmişdir. Tikilmiş qəsr həmin gəncin şərəfinə "Ağoğlan" adlandırılmışdır.

**Bərdə toponimləri Qafqaz Albaniyasının izlərini özündə əks etdirən tarixi sənəddir**

Dünyada istənilən torpaqların ilkin sakinləri və sahibləri olması faktı elmi əsaslarla toponimlərin dili ilə təsdiq olunur. Odur ki, tədqiqat üçün seçilmiş "Bərdə toponimləri Qafqaz Albaniyasının izlərini özündə əks etdirən tarixi sənəddir". mövzusu kifayət qədər aktual olan problemlərdəndir.

Tədqiqatın predmeti Bərdə toponimləridir. Burada bir sıra toponim müqayisəli müstəvidə araşdırmanın obyektinə çevrilir.

Bərdə toponimləri ilə bağlı müxtəlif istiqamətli əsərlər yazılıb. Lakin müasir dövrün tələbləri müstəvisindən yanaşmaq bu toponimlərin yenidən şərh olunması zərurətini yaradır.

**Tədqiqatın əsas məqsədi** erməni-hay bragilərin əsassız, yalan iddialarını toponimlərin dili ilə bir daha aşkarlamaqdır.

**Tədqiqatın elmi yeniliyi** iki istiqamətdə səciyyələnir: birincisi, Qafqaz Albaniyasının izlərinin Bərdə toponimlərində əks olunduğunu aşkarlamaqda, türk soylu tayfaların bu torpaqların əzəli yerli sakinləri olmasını təsdiq edən paleotoponimlərin şərhində, ikincisi, Bərdə toponimlərinin izahının yeni dövrə uyğun aspekdə müəyyənləşdirilməsində.

Onomastik vahidlər xalqımızın tarixi yaddaşı, xalq həyatının bütün sahələrini özündə əks etdirən mənəviyyat muzeyidir. Bu muzeyin eksponat incilərindən biri də toponimlərdir. Toponimlərdə xalqımızın qədim tarixi, adət və ənənəsi, mifologiyası, dünyaya baxış fəlsəfəsi, yaşam tərzi, inkişaf səviyyəsi, etnogenezi, ərazisi, bir sözlə, özünəməxsusluğu öz əksini tapır. Odur ki, hər bir rayonun toponimləri həmin ərazinin aynasıdır. Bu ayna necə varsa, eləcə də əks etdirmə funksiyasına malikdir. Bu baxımdan Bərdə rayonuna aid toponimlər də böyük əhəmiyyət kəsb edir. Bərdə toponimləri Qafqaz Albaniyasının izlərini özündə əks etdirir. Bərdə rayonuna aid toponimlərin şərhi bu günə qədər müəyyən dərəcədə işlənmişdir. Lakin nə qədər tədqiqat aparılsa da, ehtiyac duyulan məsələlər çoxdur.

IX-X əsr ərəb mənbələrində Bərdənin adı çəkilir, coğrafi mövqeyi, strateji əhəmiyyəti barədə məlumatlar verilir. X əsr ərəb səyyahı İbn Havqəl Bərdəni Aranın anası adlandırıb, qeyd edir: "Rey və İsfahandan sonra İraqla Təbəristan arasında Bərdə tək böyük və məhsuldar, tutduğu mövqeyi və xəzinəyə verdiyi gəlirə görə yaxşı yer tutur" (Axundov, 1983: 97).

Bərdə e.ə. V əsrdə bir ticarət şəhəri kimi məşhur olmuşdur. E.ə. birinci əsrdə yaşamış Strabon "Coğrafiya" kitabında Qafqaz Albaniyası haqqında bilgilər vermişdir. VİI əsrdə yaşamış Alban tarixçisi Musa Kalankaytuklu da "Alban tarixi" əsərində Albaniya ərazisinə aid paleotoponimlər haqqında

qiymətli məlumatlar vermişdir. "Paleotoponimlər dedikdə Azərbaycan ərazisində antik dövrlərdə - e.ə. və eramızın birinci minilliyində yaranmış yer adları nəzərdə tutulur" (Gəncəvi, 2004: 290).

Bərdə də Azərbaycanın qədim paleotoponimlərindədir. Bərdə ərazisindən Makedoniyalı İsgəndər, Selevkilər, Arşakilər və Roma imperatoru Avqust dövrünə aid tapılmış nimuzmatik materiallar Bərdənin hələ eramızdan əvvəl ellin ölkələri ilə əlaqələrini göstərir.

XII əsrdə yaşamış,dünya şöhrətli Azərbaycan şairi Nizami Gəncəvinin "İsgəndərnamə" poemasında Bərdə şəhərinin adının Hərum olduğu qeyd olunur:

"Hərum adlanırdı bu yurd hər yerdə,
İndisə adına deyirlər Bərdə.
Bu mərdlər, gözəllər yurdunda, inan,
Çox saysız xəzinə gizləmiş zaman" (Gəncəvi, 2004: 202).

Bu günə kimi Hərum adının izahını verən araşdırıcıya rast gəlmədik. Zənnimizcə, Hərum-hurum-rum-türkdilli qıpçaq tayfasıdır. 2010-cu ildə işıq üzü görmüş Qafqaz albanlarının ədəbi nümunələrində urum tili-rum dili anlayışı vardır ki, bu da hurum dili, türk-qıpçaq şivələrindən biri kimi qeyd edilmişdir (Tuncay, 2010: 335). Demək, Hərum toponiminin mənası türkdilli qıpçaq Hərum tayfasının məskunlaşdığı yer deməkdir.

Elmi ədəbiyyatda Bərdə sözünün müxtəlif yazılış variantlarını və müxtəlif cür izahları verilmişdir. "Bərdə coğrafi adının mənşəyini görkəmli dilçi alim akademik Ağamusa Axundov türk sözü kimi izah edir... Bərdə sözünün mənşəyi baxımından qədim türk dillərinə mənsub abidələrin dilində "qab, piyalə kuzə" mənalarında işlənən bart sözü diqqəti cəlb edir. "ə" şəkilçisinə gəldikdə, qeyd etmək olar ki, hələ görkəmli alman türkoloqu ə\a şəkilçisinin mövcud olduğunu göstərmişdi. Deməli, "qab", "piyalə" mənalarını bildirən bart sözünə sifət düzəldən "a" şəkilçisinin artırılması ilə qablı, piyaləli mənalarını ifadə edən Bərdə sözü yaranmışdır" . Bu sözün qədim variantını və bu şəhəri salanların türk olduqlarını isə tədqiqatçı alim İlhami Cəfərsoylu belə qeyd etmişdir: "Hələ də bəzi tədqiqatçılar iddia edirlər ki, Makedoniyalı İsgəndər dönəmində Azərbaycanda türklər yaşamamışdır. Biz Van qayasından tapılan yazılara istinadən göstəririk ki, 28 türk boyu 10 ildən artıq Anadoluda və Şimali Suriyada makedoniyalılarla vuruşmuşdur. Onların bəziləri isə Böyük Qafqaz dağlarının şimalına köçmüşdür.

Makedoniya işğalına qarşı duran əsas türk boyları Saruk (totemi sarı qoyun olanlar), Qarqar (qu quşuna tapınanlar), Taux (toyuğa sitayiş edənlər), Qord (ərvahı qurd olanlar), Bərdək (Bərdə şəhərini salanlar) və başqaları idi....

Gəncə, Bərdə şəhərlərinin qədim adları Gəncək və Bərdək, Əlincə qalasının ilk adı Alıncaq olmuşdur. Qarabağ yalnız bir düzün adı deyil. Naxçıvanla Təbriz arasında üç Qarabağ şəhəri olmuşdur" (Cəfərsoy, 2010: 4-5).

1968-ci ilə qədər inzibati ərazi bölgüsünə əsasən Bərdə rayonuna aid 103 kənd adı məlumdur. Lakin hazırda Bərdənin 107 kəndi var. Bu kənd adlarının hamısı Azərbaycan türk sözlərindən ibarətdir. Bu adlar Azərbaycan xalqının formalaşmasında iştirak etmiş bir sıra türkdilli alban tayfalarının və tayfa birləşmələrinin adlarını indiyə qədər qoruyub saxlayan ən qiymətli məxəzlərdir. Alpoud, Tumaslı, Zümürxaç, Kələntərli, Muğanlı, Gərənə, Kətəlparaq, Şatırlı və s. onlarla kənd adlarında xalqımızın tarixi izləri, dilimizin qədim komponentləri öz əksini tapmışdır. Yuxarıda qeyd etdiyimiz kimi toponimlər xalqımızın tarixi anlamlarını özündə qoruyub saxlayan mənəviyyat muzeyimizin daşlaşmış eksponat yaddaşıdır. Dünyanın ünvanı onomastik vahidlərdir. Dünyanı onomastik vahidlərsiz təsəvvür etmək mümkün deyidir. Ünvansızlıq heçlik, yoxluq, yer üzündən silinmək deməkdir.

Bərdə ərazisindən Mesopotomiya, Yunan və Parfiya mədəniyyəti dövrlərinə aid pullar da tapılıb ki, bu da onun o dövrdə geniş ticarət mərkəzi olduğunu bildirir. Mənbələrə görə Bərdə Qəbələ şəhərindən sonra Qafqaz Albaniyasının paytaxt şəhəri olmuşdur. Azərbaycanı işğal etmiş İran-Sasaniləri öz canişinləri üçün Qafqaz Albaniyasında iqamətgah axtarırdılar. Onların axtardıqları ərazi təhlükəsiz bir yerdə, Zaqafqaziyadan keçən mərkəzi ticarət yollarının üzərində və İranla lazımi əlaqə saxlamaq üçün nisbətən əlverişli bir yerdə olmalı idi. Bütün bu tələblərə Bərdə şəhəri cavab verdiyindən yuxarıda qeyd etdiyimiz kimi Sasanilər paytaxtı Qəbələdən Bərdəyə köçürürlər. Bərdə ticarət mərkəzinə çevrilir. Buna

görə də Bərdə adının xalq etimologiyasına əsasən izahı belə şərh edilir ki, Bərdə ticarət əlaqələri üçün əlverişli məkanda olduğu üçün "bərədə", yəni lazım olan məkanda anlamını verir.

Bərdə rayonuna aid bütün kəndlərin adı türk soylarına mənsub tayfa, nəsil adlarından törəmişdir. Alpoud, Qarayusifli, Tumaslı, Lək, Çumalar, Kələntərli, Alaçadırlı, Muğanlı, Kətəlparaq, Güloğlular, Qaraqoyunlu, Gərənə,Bəcirəvan, Şatırlı, Şirvanlı və i.a. kənd adları türk soylarının ünvan daşıyıcılarıdır.

Bərdə rayonu ərazisində hazırda Zümürxan adı ilə adlanan kənd 2007-ci ilə qədər Zümürxaç adlanmışdır. Azərbaycan ərazisində xaçla bağlı adlar birmənalı şəkildə Alban dövrünün və daha qədim dövrlərə aid türk tayfalarının daşlaşmış tarixidir. Xaç sözündən çəkinmək və onu inkar etməklə varlığı yalanlar üzərində qurulan, uydurma erməni-hay millətinin özünü təsdiqetmə planlarına rəvac veririk. Çünki heç bir əqidəsi, inamı, inancı, adət və ənənəsi, dini, vətəni, millətinin adı olmayan – Hayasi adasından dünyaya səpələnən haylar (bragi adı ilə də tanınırlar) Azərbaycana məqsədli şəkildə köçürülərək azərbaycanlı türklərin əcdadı olan Alban xalqının Ərmən türk tayfasının adı altında gizlənib, erməni adını formalaşdırmış və ərmən alban tayfasının yaşadıqları əraziləri Ermənistan adlandırıb, zəbt etmişlər. Erməni-haylar Alban Ərmən tayfasının nəyi varsa assimliyasiya edib xaçı da özəlləşdirmişlər. Bizlərə isə haram buyurub, sinəmizə xaç damğaları basmaqla xalqımızda xaç işarəsinə qarşı ikrah hissi oyatmışlar. Halbuki xaç türk-oğuz tayfalarının damğa nişanı olmuşdur. Etnik soy kökümüz olan albanlar xristianlığı erməni-hay gəlmələrdən 270 il əvvəl qəbul etmişlər. Odur ki, xaçla bağlı adlardan çəkinmədən belə adların düzgün şərhini vermək məqsədəuyğun və lazımlıdır. Azərbaycanın müxtəlif bölgələrində xaçla bağlı adlara addımbaşı rast gəlirik: Xaçmaz rayonu, Xaçbulaq yaylağı, Xaçmaz kəndi (Oğuzda), Xaçmazqışlaq kəndi (Oğuzda), Çarxaçu kəndi (Qubada), Xaçbulaq kəndi (Daşkəsəndə), Çəmbərxaç kəndi (Laçında), Xaçınyalı kəndi (Laçında), ümumiyyətlə, müxtəlif ərazilərdə Xaç daşı, Xaçın bulağı, Xaçın dərəsi, Xaçın qobusu, Xaçın düzü və s. və nəhayət, Bərdədə olan Zümürxaç kəndi belə adlar silsiləsindəndir ki, bu adlar heç də erməni-haylara aidiyyatı olmayan Alban izlərini yaşadan tarixi sübutlardır. Hər hansı bir işin doğru nəticəsini əvvəlcədən söyləyib, havada və yaxud yerdə xaç işarəsi cızıb olacağın doğruluğunu təsdiq edirik, sanki imza atırıq, sübut damğası basırıq (Belə deyirik ki, bu xaçı çəkirəm, görərsiniz, mən ölü, siz diri, bu iş belə olacaq). Demək, xalqımızın şüurunda xaç təsdiqləyici, doğru və xeyirxah inam kimi formalaşmışdır.

Zümürxaç sözü iki komponentdən "zümür" və "xaç" hissələrindən yaranmışdır. Azərbaycan toponimlərinin ensiklopedik lüğəti kitabında qeyd edilir: "Zümürxaç kəndi salındığı Zümürxaç adlı yerin adı ilə adlandırılmışdır. Bəzi tədqiqatçılara görə, bu yerin adı Azərbaycan dilinin dialektlərindəki zimir/zümür (palçıq) və xaç sözlərindən olub, "dördkünc, palçıqlı yer" mənasındadır" (Azərbaycan toponimlərinin ensklopedik lüğəti, 2007: 302). Əjdər Fərzəli isə "Dədə Qorqud yurdu" kitabında geniş və ətraflı izahatla sübut etmişdir ki, xaç oddur, ocaqdır. "Xaç — od nişanı! Bütöv od!"dur. (İncil, 1993: 88.) Xaç sözünün odla ocaqla bağlılığı bu sözün daha qədim dövrlə səsləşdiyini deməyə imkan verir. Axı atəşpərəstliklə bağlı daşlaşmış deyimlər dilimizdə bu gün də işlənməkdədir: Məsələn, bu ocağa and olsun, odda yanım, bu isti zindan haqqı, günəşə kor baxım, o işıq haqqı və s. Buradan aydın olur ki, zümür/zimir palçıq, xaç isə ocaq deməkdir. Deməli, zümürxaç palçıq ocağı, yanar palçıq məkanı deməkdir. Yəni müalicəvi əhəmiyyətə malik palçıq yatağı olan bir məkandır. Hazırda bu kəndin yaxınlığında müalicəvi əhəmiyyətə malik "Yanar su ocağı" yüzlərlə xəstələrin ümid yeridir.

Ümumiyyətlə, Bərdə rayonuna aid toponimlərin az bir hissəsinin izahı çətinlik törədir ki, bunlar da paleotoponimlər adlanır. Bu toponimlərin 99%-i müasir Azərbaycan türk dilinə və qədim türk dillərinə mənsub sözlər əsasında formalaşmışdır. Bu da ulu əcdadlarımız olan alban etnosunun türk mənşəli olması və müxtəlif türkdilli tayfaların qədim dövrlərdən bu yerlərin sahibi olmasını sübut edən faktlardır.

Bərdə rayonuna aid toponimlərin şərhi təsdiq tdir ki, bu torpaqların ulu sakinləri türk mənşəli alban etnosudur.

Bərdə, Hərum və Zümürxaç toponimlərinin müasir yanaşma prizmasından şərh olunması tədqiqatın elmi yeniliklərindən biridir.

Bərdə toponimlərinin 99%-i (Alpoud, Qarayusifli, Tumaslı, Lək, Çumalar, Kələntərli, Alaçadırlı, Bərdək, Muğanlı, Kətəlparaq, Güloğlular, Qaraqoyunlu, Gərənə, Bəcirəvan, Şirvanlı və s.) etnoslardan yaranmışdır. Ümumiyyətlə, onomastik vahidlər sırasında toponimlərin əksəriyyəti etnonim mənşəlidir.

Atalar demişkən: "Torpaqda izi olmayanın, süfrədə üzü olmaz". Babalarımızın bu dahiyanə sözlərinə söykənib deyə bilərik ki, torpaqda yaşamayanın izi olmaz, tarixdə sözü qalmaz.

**Ağcabədi Türk uluslarının yaşayış məskəni, Oğuz yurdudur**

Toponimlərin dili ilə min illər bizdən öncə olan qaranlıqlara aydınlıq gətirilir, daim torpaq iddiasında olan məkrli erməni - haylara tarixi reallıq sübut və dəlil kimi göstərilir, şərh olunur. Odur ki, qeyd etdiyimiz kimi etnoqrafik, tarixi, ədəbi materialların, faktların aşkarlanmasına indi yeni səpkidə yanaşma daha vacib və daha zəruridi.

Kainatın ən qədim mədəniyyət ocaqlarından biri də Azərbaycandır. Bu ölkənin altı da, üstü də tükənməz xəzinədir. Hər qarış torpağı canlı bir tarixdir. Bu tarixi yaşadan, minilliklərdən bu günə və sabaha doğru, düzgün məlumatlar verən, babalardan bizə yadigar qalan xüsusi adlardır ki, bunlar dilçilikdə onomastik vahidlər adlanır. Onomastik vahidlər bütün dünyanın ünvan dilidir, tarixi pasportudur, etnik sikkəsidir. Hər bir regionun özünəməxsus onomastik vahidləri mövcuddur. Odur ki, Ağcabədi rayonunun da burada yaşamış etnosların psixologiyasına, anlam tərzinə, dünyagörüşünə, həyata baxış fəlsəfəsinə uyğun onomastik vahidləri vardır. Bu onomastik vahidlər içərisində toponimlər xüsusi əhəmiyyət kəsb edir. Çünki bu toponimlər dil açıb söyləyirlər ki, bu yerlərin ən qədim köklü sakinləri türksoylu etnoslar olmuşlar. Odur ki, Ağcabədi türk uluslarının yaşayış məskəni, ən qədim Oğuz yurdudur - deyirik. Bu anlamı bizə aşağıda adları qeyd olunmuş toponimlər söyləyir: Aran kəndi, Bayat kəndi, Avşar kəndi, Bilağan kəndi, Qarabağ düzü, Qaradolaq kəndi, Qarqar çayı, Kəbirli kəndi, Taynaq kəndi, Köyük kəndi, Kültəpə, Muğanlı kəndi, Pərioğullar kəndi, Tərtər çayı, Ergi düzü, Sarıcalı kəndi və s. Adları qeyd olunan toponimlərdən bir neçəsinin anlamına, etimologiyasına və tarixən nə zamandan elmə məlum olmasına diqqət yetirək.

**Ağcabədi -** Ağcabədi sözü türk mənşəli sözdür, ağca və vadi sözlərindən ibarətdir. Xalq arasında [Ağcavədi] kimi tələffüz olunur. Lakin söz Ağcabədi şəklində formalaşmışdır. Yaşayış məntəqəsi kimi Ağcabədinin tarixi e.ə VI-V əsrləri əhatə edir. Burada enolit dövrünə aid gil qablar tapılmışdır. Nərgiztəpə, Qalatəpə ərazilərində orta tunc dövrlərinə aid (e.ə III minilliyin axırı və II minilliyin əvvəli) kurqan küp və tunc qablar tapılmışdır. Deməк, Ağcabədi ərazisində insan məskənləri e.ə. IV əsrin sonlarına təsadüf edir. Tarixi ədəbiyyatdan məlum olduğu kimi Ağcabədi ərazisi Qafqaz Albaniyasının tarixi vilayəti olan Arsax/Ərsaq bölgəsinin tərkib hissəsi olmuşdur. Moisey Kalankatuklu "Albaniya tarixi" əsərində Ağcabədi adını "Ağbəd" şəklində işlətmişdir: "Mehranilər soyundan olan Vardan Kaç idi. Albaniya çarı Vaçaqanın dövründə o, Aquen kilsə qurultayında sədrlik edirdi. O, Girdimana köçmüşdü; sonra çar nəslindən olan Patriks Karoyan idi. Bu da həmən çar Vaçaqanın icazəsilə Ağbəd vilayətinə köçmüşdü" (Kalankatuklu, 1993: 181). Zənnimcə, burada qeyd olunan Aquen-Ağdam, Ağbəd isə Ağcabədi deməkdir. Ağvəd-Ağ vadi mənasındadır.

"Ağcabədi ensiklopediyası" kitabının müəllifi Nazim Tapdıqoğlunun şərhinə görə "Ağcabədi sözünün mənası türk mənşəli ağ ("torpaq") və ərəb mənşəli badiye ("düzəngah", "səhra") sözlərindən ibarətdir. Ağcabədi sözünə yaşayış məntəqəsi kimi ilk dəfə 1593-cü il mənbəsində rast gəlirik" (Tapdıqoğlu, 2007: 48).

Belə bir rəvayət söyləyirlər ki, bir nəfər şah Abbasdan borc axça alıb bu sahələrdə toxum səpib gəlir əldə etmək istəyir. Lakin bu ərazilər şoran olduğu üçün taxıl bitmir və kişinin mayası batır. Bir gün Şah Abbas həmin şəxslə bu ərazilərdən keçən zaman boş ağaran düzənliklər haqqında məlumat öyrənmək istədikdə buraya maya qoyan və əli boşa çıxan şəxs yanıqlı-yanıqlı cavab verir ki, şahim, axçamı bada verən yerdi bu yer. O gündən etibarən bu yerə axça bada gedən yer demişlər və sonradan axça–"ağca", bad isə "bədi" şəklinə düşmüş, Ağcabədi sözü formalaşmışdır. Təbii ki, bu rəvayət xalq etimologiyasıdır. Ağcabədi sözünün doğru anlamı isə ağca vadi duyumuna daha uyğun gəlir.

"Kitabi-Dədə Qorqud" eposunda Ağca qala toponimi qeydə alınmışdır. Qiyasəddin Qeybullayevin verdiyi məlumatda isə göstərilir: "Orta əsrlərdə Türkiyədəki Qarabağ Ağcaqala sancağının mərkəzi idi" (Qeybullayev, 1992: 17). Burada təsadüfi olaraq Ağcaqala sancağının mərkəzini Qarabağ adlandırmamışlar. Ağcaqala Qarabağa məxsus ərazi vahidi olduğu üçün Türkiyədə yaranmış Ağcaqala sancağının mərkəzini də Qarabağ adlandırmışlar. Qarabağ tayfası həmin sancaqlığı yaratmış və mərkəzini də Qarabağ adlandırmışlar. Qarabağın bir hissəsi olan Ağcabədi, xalqımızın tarixi abidəsində "Kitabi-Dədə Qorqud" dastanında Ağcaqala adı ilə öz əksini tapmışdır. Demək, Ağcabədi qədim

dövrlərdə Ağcaqala adı ilə adlanan Oğuz yurdu olmuşdur. Onu da qeyd edək ki, Ağca və Qarabağ adları etnonimdirlər. Çünki bu toponimlərə müxtəlif ərazilərdə rast gəlirik. Ağca və Qarabağ bir ərazinin relyefinə uyğun rəng və bağ mənaları bildirə bilər. Lakin adlar ayrı-ayrı zonalarda özünü göstərirsə, deməк, bu adları oraya daşıyan etnoslar vardır. Odur ki, Ağca və Qarabağ etnonimdir. Azərbaycanda "Ağca" adı ilə bağlı kənd, yurd, gədik, və sair adlar mövcuddur. Ağcayevlər nəsli bu gün də Qarabağda yaşayırlar. Tiflisin bir nahiyəsi də Ağca qala adlanır. Naxçıvanla Təbriz arasında üç Qarabağ şəhəri olmuşdur. Bu qala və şəhərləri Ağca və Qarabağ etnosları yaratmışlar.

**Aran kəndi** — Aran sözü ilk dəfə Klavdi Ptolemey (e.ə. II əsr) tərəfindən Tosaren kimi qeyd olunub. Qədim türk dillərində tus – "duz", aren – "aran" deməkdir. I əsr müəllifi Pilini Şimali Qafqazda yaşayan aran/oran tayfaları haqqında məlumat vermişdir. Musa Kalankaytuklunun (VII əsr) "Alban tarixi əsərində, Mahmud Kaşqarinin (XI-XII əsr) "Divani-lüğətit türk"əsərində də Aran sözünə və məna çalarlarına rast gəlirik. Axırıncı elmi araşdırmaların nəticəsinə görə Aran toponimi mənşəcə türkdilli qıpçaq tayfasının adıdır. Azərbaycan türklərinin etnogenezində qədim türkdilli qıpçaqların tərtər, qaraborg, aran tayfaları mühüm rol oynamışlar. Demək aran toponimi eramızdan öncə türkdilli türk etnosu olan aran tayfasının adından yaranmışdır. Aran etnonimi vaxtilə ərən formasında olmuşdur. Hətta antroponim kimi formalaşdıqda da Ərən şəklində səslənmişdir. ərən şəxs adı kimi Alp-Ərən formasında "Kitabi-Dədə Qorqud" eposunda öz əksini tapmışdır. Ər sözü bir neçə sözün tərkibində əcnəbi dillərdə "a" səsi ilə səsləndirilmişdir. Ərən-Aran, Ərsaq-Arsaq, Ərbak-Arbaq və s. Ərən sözü olduğu kimi Əsgərən qalası toponimində ərən kimi qorunub saxlanmışdır. Qədim mənbələrdə Albaniya ölkəsi Aran adı ilə də adlanır. "Şimali Azərbaycan ərazisi eradan əvvəl IV əsrdən başlayaraq antik mənbələrdə Albaniya adlanır. Bütün qədim mənbələrdə şimali Azərbaycan ərazisinin qədim əhalisi alban adlandırılır. Burada alban adlı konkret (etnik adı "alban" olmuş) bir etnos yaşamasaydı, digər tayfalar içərisində çoxluq təşkil etməsəydi və aparıcı rola malik olmasaydı, ölkə Albaniya adlanmazdı" (Qeybullayev, 1992: 15).

Bu sitata əsaslanıb deyə bilərik ki, aran nəsli elə alban nəslidir ki, ölkə həm də Aran adlanır. Demək, Ağcabədi ərazisi Albaniyanın tərkib hissəsinə daxil imiş. "Deyilənlərdən belə nəticəyə gəlmək olur ki, alban etnosu bilavasitə azərbaycanlıların, alban dili isə Azərbaycan dilinin əcdadıdır" (Qeybullayev, 1992: 28).

**Taynaq kəndi –** Taynaq sözü iki komponentdən ibarətdir. (Tay və naq). Qədim türk dillərində tay – "bərabər", "eyni", "münasib", "tək" və s. mənaları bildirir. Nak, ınak isə - "dost", "etibarlı adam", "yaxşı yoldaş" deməkdir.

Parnak, Ərnak, Kornaq sözləri də Taynaq sözü kimi türk sözləridir və Musa Kalankaytuklunun "Alban tarixi" (VII əsr) əsərində qeyd olunmuşdur.

Məncə, Taynaq qədim türk etnosunun adıdır. Münasib yoldaş. Dostluqda tayı, bərabəri olmayan etibarlı adam mənalarını ifadə edir.

İlhami Cəfərsoya görə Tay etnonimdir, totem mənşəli olub, ata sitayişlə bağlıdır. Daylaq kəndinin əhalisi qədim dayların son qalıqlarıdır.

**Bayat kəndi, Bayat eli.** "Kitabi-Dədə Qorqud" eposunun müqəddiməsinin birinci cümləsində belə yazılmışdır: "Rəsul əleyhissəlam zamanına yaxın Bayat boyundan, Qorqud ata deyərlər, bir ər qopdu. Oğuzun ol kişi tamam bilicisiydi. Nə dersə olurdu. Qayibdən dürlü xəbərlər söylərdi. Haq Taala onun könlünə ilham edərdi" (Fərzəli, 1999: 19). Buradan aydın olur ki, Bayat boyu VI yüzillikdən əvvəl mövcud imiş və türk dünyası üçün peyğəmbər xislətli şəxsiyyətlər yetirirmiş. Bu boy təkcə Dədə Qorqudu deyil dünya şöhrətli dahi Füzulini, Yəhya Kamalı, Üzeyir Hacıbəyovu türk dünyasına bəxş etmişdir.

Bayat sözünün məna çözümünü İlhami Cəfərsoy belə açıqlayır: "Bu sözün türk dillərində qalmaqda olan anlamları onun ilkin mənasını bərpa etmək üçün bəs etmir. Slavyan qaynaqlarında qorunub saxlanan mənaların yardımı ilə onu müəyyən etmək mümkündür.

Qədim slavyan dilində bayatı tilsimləmək, serb-xorvat dilində ovsunlamaq mənasına malikdir. Eləcə də rus dilinin ləhcələrində quşu quş dilində çağırıb tora salmağa bait deyilir.

XIV yüzildə quşçu elindən çıxan qoşun başçılarından birinin ləqəbi Bayıtmış idi. Onun adı tarixi mənbələrdə Əmir Bayıtmış Quşçu kimi qalmışdır.

Bayan həm sehrkar, həm də musiqini himayə edən tanrı - ruh idi. Sonra qopuz və saz sənəti də təkmilləşərək bir-birindən ayrıldı. Bayatı həm şeir, həm də musiqi növü oldu.

Salman Mümtaz və Əmin Abidin yazdıqlarına görə bayatı şeir növünü bayatlar yaratmışlar. Elə bayatı musiqi növü də onlara məxsusdur. Bu musiqi muğam deyildi. Sonradan tariximizdən süzülüb gələn bu türkülər İran xalları ilə qaynayıb - qarışdı, bayatıdan Bayatı-kürd, Bayatı-şiraz, Bayatı-əcəm, Bayatı-isfahan, Bayatı-qacar və s. şaxələndi.

Bayat tayfasının keçdiyi iki min ildən artıq ömür yoluna nəzər salarkən gəldiyimiz nəticələr bir daha təsdiq olunur. Qəbilə quruluşu dövründə tarixə tanrı elçiləri, tanrı köməkçiləri verən bayan - bayat etnosu sonralar tük dünyasında xanlıqlar, xaqanlıqlar meydana çıxanda alimlər, şairlər, vəzirlər yetirdi" (Cəfərsoy, 1995: 20-22).

Demək bayat etnosu ən qədim tarixə malikdir. Bayat türk dünyasının aparıcı etnoslarından biri kimi Ağcabədi ərazisində ululuğu, əsas mövqeyə malik olması ilə bu diyarın bir daha türk uluslarının yaşayış məskəni, oğuz yurdu olduğunu təsdiqləyir.

**Ergi düzü (kəndi)** — Ergi Alban tayfasının adını daşıyır. Bu sözə egri-əgri-ergi şəkillərində rast gəlinir. Türk dillərində g-r, r-g səslərinin yerdəyişməsi, əvəzlənməsi hadisəsinə rast gəlinir. Bu cür dil hadisəsinə dilçilikdə metateza deyilir. Məsələn: yorğan-yoğran (rğ-ğr), torpaq-topraq (rp-pr), yarpaq-yapraq (rp-pr) və s. Odur ki, ergi-egri-əgri və ayrı sözləri eyni adlı etnosdan əyri tayfalarının adından formalaşmışdır. Əyri adına Əyri çay (Qanıx çayının bir qolu) Əyricə kəndi (Bərdədə) sözlərində rast gəlirik. Əyri tayfası tərəkəmə həyat tərzinə malik olmuşlar, sonradan oturaq həyat tərzinə keçmişlər.

"VI əsrdən cənub-qərbi Qafqazda Egri (Eqrisi) adlı vilayət vardı. L.N.Qumilyov yazır ki, bu yerin adı türklərin Gürcüstana hücumu ilə bağlı çəkilir. Ancaq Qafqaz kilsə salnamələrindən görünür ki, egrilər Cənubi Qafqazda daha əski dönəmlərdə yaşamışlar" (Cəfərsoy, 2005: 151).

Sitatdan da aydın olur ki, ergi-egri-əyri alban tayfaları Qarabağın qədim sakinləri olmuşlar və bu ərazilərdə öz izlərini qoymuşlar.

**Sarıcalı kəndi**---Sarıca tayfasının məskunlaşdığı yer Sarıcalı adlanmışdır. "Sarıca ---"Türkmən şəcərəsi"ndə Kızık boyunun quşu sarıca adlanır. B.Ögel göstərir ki, Anadoluda bir ovçu quş var. Qızılca sarı rəngdədir. Azəbaycan dilində ona sarıca deyilmişdir.

Sarıca VIII əsrdə Qarabağın güclü oymağı idi. Əhməd bəy Cavanşir yazır ki, Pənah xan Cavanşir elinin Sarıcalı oymağından çıxmışdır.

XIX əsrin ortalarında Qazaxlı tayfasının bir qəbiləsi Sarıcalı adlanırdı. Orta Anadoluda yaşayan yürük elinin bir oymağı Saraclı olmuşdur. İndi Gürcüstanın Marneuli rayonunda Saraclı, Azərbaycanın Ağcabədi bölgəsində Sarıcalı kəndləri var" (Cəfərsoy, 2005: 237). Şəki rayonunda olan Sarıca kəndi də "Sarıca" tayfasının adını daşıyır.

Demək, indiyə qədər izah olunduğu kimi deyil, yəni Sarıcalı --- sarıca Alının adını daşımır, sarıca tayfasının adını daşıyır.

**Qaravəlli kəndi**----Bu kəndin adı Mil (Bel) tayfasının adından yaranmışdır. "Mil (Bel) Azərbaycanın köçəri elatlarından biri idi. 1875-ci ildə tərtib edilmiş etnoqrafik məlumatlar toplusunda göstərilir ki, Milli tayfası türk dilində danışır.

Bellərin bir qanadı olan Qara Bel son mənbələrdə Qaravəlli adı ilə qeydə alınmışdır. Bel teonimi ilə bağlı Kəlbəcərdə üç Milli kəndi var. Ölkəmizdəki Mil düzü bellərin yurdu olmuşdur. XX əsrin önlərində Quba qəzasında Ağbil, Cavad və Şamaxı qəzalarında Qaravəlli kəndləri vardı" (Cəfərsoy, 2005: 16). Bu gün isə Qaravəlli kəndi təkcə Ağcabədidə deyil, Ağsuda, Balakəndə, İmişli və Şamaxıda da Qaravəlli kəndləri vardır.

Demək, Qaravəlli adı Qara Bel tayfasının bu ərazilərdə məskunlaşması nəticəsində yaranmışdır.

**Pərioğullar kəndi** — Rəvayətə görə İbrahim xanın Pəri arvadın oğullarına bağışladığı ərazidə Pərinin oğulları məskən salıb yaşadıqları üçün bu kənd Pərioğullar adlandırılıb. Hətta xalq arasında söylənilir ki, İbrahim xan deyərmiş:

Hər ağacdan masan olmaz,
Hər igiddən Həsən olmaz,
Hər oxuyan molla, Pənah,
Hər qatırçı Murad olmaz.

Deyilənə görə bu ifadələri İbrahim xan söyləmişdir.

–Hər ağacadan Masan olmaz-deyimi çox qədim dövrlərlə səsləşir. Masan yer əkmək üçün alətdir, ağacdan hazırlanır. Buna cüt və yaxud xış da deyiblər. Meşədə hər ağacdan onu düzəltmək olmazmış, çünki Masanın üç qolu olur və iki dirsəkli ağacdan hazırlanır. İki qoldan majgal tutur, bir qol isə öküzün boyunduruğuna bağlanır. Məncə, Masan, xış, cüt, maj, majgal, kiş, hodaq və s.bu kimi əkinçiliklə bağlı sözlər ulu dilimiz olan Şumer (Şumər) dili ilə bağlıdır:

Kotanın hodaqları,
Bar tutub dodaqları,
Qarğaram kotan sına,
Dağıla hodaqları.

–Hər igid Həsən olmaz–deyimi ilə bağlı xalq arasında belə bir yozum işlənir. Söyləyirlər ki, Pəri adlı xanımın əri ölür və oğlanları yetim qalır. Pərinin Həsən adlı oğlu uşaq vaxtından cəsur, bacarıqlı və qorxmaz olur. Bir gün İbrahim xan başının atlı dəstəsi ilə ovdan gəlirmiş, görür ki, bir neçə uşağı bir uşaq sıraya düzüb əsil hərbiçi kimi təlim keçir. İbrahim xanın bu mənzərə diqqətini cəlb edir və təlim verən balaca uşağa yaxınlaşıb soruşur:Ay uşaq, adın nədir?

–Həsən.

Kimin oğlusan?

–Pərinin.

Mənimlə Qalaya (Şuşa Qala adlanırmış) gedərsənmi?

–At versəniz gedərəm.

İbrahim xan balaca uşağın belə cəsarətə malik olmasından xoşu gəlir və Həsəni özü ilə götürüb Qalaya aparır. Həsənin haraya və kiminlə getməsini bilməyən Pəri ana şivən qoparır ağı deyir:

Mən aşiqəm ha səni,
Haqq saxlasın Həsəni,
Xəstə könlü nar istər,
Mənim könlüm Həsəni.

Həsən İbrahim xanın sarayında bir müddət qalıb təlim alır, ən yaxşı bir döyüşçü kimi yetişir. İbrahim xanın sadiq döyüşçüsü olur. Odur ki, İbrahim xan ona mülk verdikdə Həsən Törə təpədə olan Məxmər yatağını istəyir. Həmin mülk Pəri oğullarına verilir. Pəri oğulları burada məskən salıb yaşadıqları üçün oranı Pəroullar adlandırırlar. Həsənin cəsurluğu, igidliyi dillərə düşür, dastanlaşır; ”Hər igid Həsən olmaz”– ifadəsi belə yaranır.

–Hər oxuyan molla, Pənah olmaz ifadəsi də İbrahim xanla bağlı formalaşmışdır. Molla Pənah Vaqif Qarabağa gələn zaman mirzəlik və mollalıq edirmiş. Ədəbi-nəzəri fikirdə məlum olduğu kimi Vaqif İbrahim xanın sarayına dəvət olunduqda əvvəlcə eşikağası, daha sonra isə vəzirlik rütbəsinə yüksəlmişdir. Ona görə də, onun haqqında belə deyim formalaşır ki, hər oxuyan molla, vəzirlik rütbəsinə yetişə bilməz, amma Vaqif yüksələ bilər. Odur ki, “Hər oxuyan molla, Pənah ola bilməz” deyimi bu gün də məsəl kimi işlənməkdədir.

–Hər qatırçı Murad olmaz. Bu ifadənin yaranmasını Hacısamlı bəyi Paşa bəyin atası Nəbi oğlu Murada da aid edirlər. Lakin bu ifadə Ağdamda yaşamış Alverdi oğlu Murad haqqında deyilmişdir. Deyilənə görə Ağdamın Muradbəyli kəndi Alverdi oğlu Muradın şərəfinə belə adlandırılıb.

Belə söyləyirlər ki, Murad İbrahim xanın qatırçısı olub. O qatıra, ata elə qulluq edərmiş ki, heç kim onun işini görə bilməzmiş. Bir dəfə İbrahim xanın mindiyi ayqıra elə qulluq edir ki, at bədlik edir xan onu minməkdə çətinlik çəkir. Xan bu sirri öyrənmək üçün Muradın qulluq üsuluna müşahidəçi təyin edir. Müşahidəçilər görürlər ki, Murad peyini əzib at və qatırların saxlandığı yerə səpdi və peyinin yumuşaq olub-olmadığını yoxlamaq üçün soyunub həmin yerdə at kimi ağnamağa başladı. Harada bədənini əzən peyin qurusu tapdısa elə oradaca onu əzdi və rahatladı. Beləliklə atın və qatırın birinci yerini rahat edib, sonra onların yemini verdi. Demək, onun qulluq üsulunun sirri bunda imiş. Müşahidəçilər bu sirri xana olduğu kimi danışırlar. Xan Muradın öz işinə belə canıdildən bağlı olduğunu görüb, ona bəylik verir və yaşadığı kəndi onun şərəfinə Muradbəyli adlandırır. Ağdamda məşhur şəxsiyyət olan Qara bəy Murad bəyin nəvəsidir, Hacısamlı Paşa bəyin qızı Ziba xanımın həyat yoldaşı olub.

Elmi ədəbiyyatda isə Pərioğullar adının leksik elmi duyumu belə çözülür: "Türk mifolojisində Tanrı övladlarından fərqli olaraq Pəri oğlanları insanların bədxahı kimi görünürlər. Pəri oğlanlarından biri Təpəgöz idi. Oğuzların bədxah pərilər qarşısında qorxusu Pəriavul və Pərili etnik adlarının yaranmasına səbəb olmuşdur.

Abbasqulu ağa Bakıxanov yazır ki, Dağıstanda Pəriavul adlı kənd vardı. İndi Ağdam və Ağcabədidə Pərioğullar kəndləri var.

Pəriyə pərəstiş edən adamlar xristian albanlar arasında da olmuşdur. Albaniyanın dağlıq vilayətlərindən biri Parisos adlanırdı. 1139-cu il zəlzələsində Parisos şəhəri və vəngi dağılmışdır" (Cəfərsoy, 2005: 48).

Bu barədə antik dövr qaynaqlarında müəyyən məlumatlar öz əksini tapmışdır. Yunan coğrafiyaçı və tarixçisi Strabon e.ə. yazdığı kitabında qeyd etmişdir ki, Albaniyada amazonkalar yaşayırlar. "Onların sağ döşünü uşaq vaxtında yandırırlar ki, hər cür iş görəndə, xüsusilə nizə atanda sağ əldən sərbəst istifadə etsinlər. Onlar həmçinin ox-yay, döyüş baltası və yüngül qalxan da çox işlədirlər... Yazdakı 2 xüsusi ayda onları qarqarlardan ayıran qonşu dağa qalxırlar. Çox qədim bir mərasimə görə isə, qarqarlar da həmçinin bu dağa çıxırlar ki, qadınlarla birlikdə qurban verib uşaq doğmaları üçün onlarla yaşasınlar; kim kimlə düşdü, onlar xəlvət, qaranlıqda görüşürlər; qadınları hamilə edərək, qarqarlar onları evlərinə buraxırlar. Qadın cinsindən olan bütün körpələri amazonkalar özlərində saxlayır, kişi cinsindən olanları isə tərbiyə olunmaq üçün qarqarlara verirlər. Hər bir qarqar ona gətirilən hər hansı körpəni görmədən-bilmədən öz oğlu sayıb onu qəbul edir" (Azərbaycan tarixi üzrə qaynaqlar, 1989: 19). Burada verilən bilgiyə dirsəklənib deyə bilərik; Pəri oğulları amazonkaların qarqarlara verdikləri oğullardır ki, Qarqar çayının sahilində kənd salıb yaşayıblar. Ona görə də bu kənd Pərioğullar kəndi adlandırılıb.

"Minlərlə söz --- minlərlə sənəddir. Bu sənədləri oxuya bilməklə---sözün arxeloqu olmaqla elmi daha da zənginləşdirmək, tarixi saxtalaşdırmadan xilas etmək olar" (Fərzəli, 1999: 315).

Araşdırmalarımızdan bəlli oldu ki, həqiqətən də Ağcabədi türk uluslarının yaşayış məskəni olmuş və Oğuz yurdu kimi "Kitabi-Dədə Qorqud" eposunda Ağcaqala adlandırılmışdır. Kaş elə həmişə bu torpaqlarda Ağca türk etnosu qala, yaşaya və bu məkanımız da Ağcaqala adlana.

## Laçın rayonu ərazisində formalaşan qədim və ortaq Türk adları

Vahid millətə mənsub olan çoxsaylı Türk xalqları tarixən dünyanın müxtəlif ərazilərində məskunlaşmışlar. Bu faktı qoruyub saxlayan Türk mənşəli onomastik vahidlərdir. Türk mənşəli onomastik vahidlər dünya miqyasında — Balkanlarda, Bolqarıstanda, Rusiya Federasiyası, Orta Asiya respublikaları, Türkiyə, İran, İrak, Zaqafqaziya və s. ərazilərdə geniş yayılmışdır. Bu da Türk xalqlarının tarixən geniş ərazilərin sahibi olmasından xəbər verir.

Azərbaycanın böyük strateji əhəmiyyət kəsb edən Laçın bölgəsində də ortaq Türk adları geniş yayılmışdır. Bu isə Laçının qədim Oğuz yurdu, Türk uluslarının yaşayış məskəni olmasından xəbər verir. Belə adlar onomastik vahidlərin hər bir sahəsində özünü əks etdirir. Məsələn; Gəray, Mürşüd, Mürid, Mesrop, Bulğar, Nijavad, Bağır, Azay, Saday, Xasay, Leysan, Mapı, Şapı, Qırımxan, Bulus, Yunus kimi şəxs adlarında, Şiney dağı, Vəzzoxlar, Salniyin yalı, Xaşınyalı, Piçənis, Bəzir yeri,Bəzirxana, Bəzir daşı, Bəzir dəyirmanı və s. yer-yurd adları qədim dövrlərdən soraq verir.

Laçın rayonu ərazisində qorunub saxlanılan qədim Türk mənşəli alaşar (alışar), art, bair, bay, parmaq, bet, bük, yazı, kömür, sarp, çal və s. terminlər bəzi onomastik vahidlərin tərkibində bu gün də işlənməkdədir. Belə sözlərdən bir neçəsinə diqqət yetirək.

Alaşar (alışar) sözü qədim Türk dillərində "alçaq dağ" mənasında işlənir. Laçın rayonunda Alaşar qaya adlanan yer vardır.

Art sözü qədim Türk mənşəlidir, "dağ keçidi", "aşırım" və s. mənaları bildirir. Salvard zirvəsi, Salvard yaylası.

Bair qədim Türk dillərinə aid sözdür, "təpə", "yüksəklik", "dağ tirəsi" və s. mənalarını bildirir. Çalbair dağı Dambulaq kəndi yaxınlığındadır. Çal sözü türk dillərində "təpə", "daş" mənası bildirir. Çalbayır sözündə bayır komponenti "dağ döşü", "yamac" mənasında işlənmişdir.

Bay sözü qədim Türk dillərinə aiddir, "varlı" mənasındadır. "Kitabi - Dədə Qorqud" dastanında da bu sözə rast gəlirik. "Qadir Tanrı verməyincə ər bayımaz" (Qeybullayev, 1992: 19). XVI-XVII yüzilliklərdə Laçın rayonunda yaşayıb yaratmış və Laçın rayonunun Güləbird kəndi yaxınlığında

məqbərəsi olan, bayatı ustası Sarı Aşiq də bağlama xarakterli bayatılarından birində bay sözünü qədim və ilkin anlamında işlətmişdir:

Mən Aşiq bayı keçdim,
Kasıbı, bayı keçdim.
Altı camış, yüz keçi,
Qucaqda çayı keçdim.

Laçın rayonunun Mirik kəndi yaxınlığında Bayqara dərəsi adlanan yer vardır.

Parmaq sözü qədim Türk dillərinə aiddir, "təpə" anlamında işlədilir. Laçın rayonunda Barmaqlar dağı vardır.

Bet sözü bat şəklində də işlənir. "Dağın yamacı", "dağın döşü", "yüksəklik" mənalarını bildirir. Laçında Çarçanbent dağı, Çarçanbent təpəsi qeydə alınmışdır.

Bük sözü qədim Türk dillərində "dar yarğan", "dağ keçidi", "ensiz dağ vadisi" və s. mənalarında işlənir. Minkənd kəndi yaxınlığında Büktəpə adlanan yer vardır.

Yazı sözü qədim Türk dillərində "çay, dəniz kənarı", "çöl", "düzən" mənalarında işlənir. Laçın rayonunda Ağcayazı kəndi, Ağcayazı dağı, Ağcayazı düzü, Ağcayazı təpəsi, Ağcayazı çölü vardır.

Sarp sözü qədim Türk dilində "uçurum", "çətin keçilən qaya", "sıldırım dağ" və s. mənalarda işlənir. "Kitabi – Dədə Qorqud"da da sarp sözü işlənmişdir. "Sarp yürirkən Qazılıq ata namərd yigit binə bilməz, binincə binməsə, yeg!" (Kitabi-Dədə Qorqud, 2004: 20). Laçın rayonunun Mişni kəndi yaxınlığında Sapavur — Sarpavur təpəsi qeydə alınmışdır.

Qeyd olunmuş real faktlara əsaslanaraq deyə bilərik ki, Laçın rayonu ərazisinə aid qədim Türk mənşəli onomastik vahidlərin bu günə qədər qorunub saxlanılması Türkdilli tayfaların bu yerlərin ən qədim sakinləri olmasını təsdiq edir. Həmçinin burada yaşayan sakinlər də türk olmuşlar ki, bu günə qədər tarixi reallığı qoruyub saxlamışlar. "Laçın rayonunun ərazisi qədim dövrlərdən başlayaraq Azərbaycan xalqının təşəkkül prosesində iştirak etmiş türk uluslarının yaşayış məskəni olmuşdur. Ona görə də istər qədim, istərsə də müasir el-oba adlarını köksündə yaşadan bu qədim Azərbaycan diyarının toponomiyasının əksər hissəsini milli dil vahidləri hesabına yaranan yer adları təşkil edir" (Abışov, 2007: 7).

Laçın rayonu ərazisində tarixən nəsillər dəyişsə də bu yerlərin ilk sakinlərinin toponimlərdə qoyduğu izlər, adlar dəyişməz olaraq qalır. Odur ki, Türk xalqlarının keçmişin özündə yaşadan etnonim mənşəli yer adları yüzlərcədir. Bunlara əsasən müəyyənləşdirmək olur ki, hansı etnoslar burada vaxtilə məskunlaşmışlar. Burada tarixən məskunlaşan türkdilli tayfanın və həmin tayfanın adı ilə adlanan toponimin adlarına aşağıdakıları misal göstərmək olar:

Laçın tayfası ------- Laçınkənd kəndi.
Minq/mink tayfası ------- Minkənd kəndi.
Maq, mağ/muğ tayfası ------- Mağouz dərəsi.
Quşçu tayfası ------- Quşçu kəndi.
Abdal tayfası-------- Abdallar kəndi.
Boz ulusu, tayfası ------- Bozlu kəndi.
Peçənə ulusu, eli ------- Piçənis kəndi.
Çor tayfası ------- Çorman kəndi.
Sadak tayfası-------- Sadınlar kəndi.
Siraq (çiraq) tayfası --------Çiraqlı kəndi.
Bayandur tayfası ------- Bayandur kəndi.
Qızılca tayfası ------- Qızılca kəndi.
Bozdağan tayfası --------Bozdağan kəndi.
Alpout tayfası -------Alpout kəndi.
Ağca tayfası-------- Ağcayazı kəndi.
Qılıclı tayfası-------- Qılıclı kəndi və s.

Belə Türkdilli tayfaların və toponimlərin sayı Laçın rayonu ərazisində yüzlərcədir. "Belə etnooronimlərin mənşəyinin izah edilməsi ilə biz bir növ Azərbaycanın qədim əhalisinin etnik tərkibini və tarixini, Azərbaycan xalqının soy kökünü öyrənmiş oluruq. Laçın rayonunda yerləşən Abdal dağı, Abdal dərəsi, Abdal təpəsi oroqrafiq obyektləri etnonimlə bağlı olan oronimlərdəndir...

1588-ci ilə aid olan mənbədə Qarabağ düzündə Həsən Abdallı elinin yaşadığı da göstərilir. Abadel/abdal tayfasını akademik V.V. Bartold Hun tayfası hesab edir. A.A.Bakıxanov da Abdal adlı tayfanın hələ çox-çox əvvəllər Azərbaycanda yaşamasını qeyd etmişdir. Türkiyədə, Başqırdıstanda, Qazağıstanda, Türkmənistanda, Qırğızıstanda və Özbəkistanda (Qaraqalpaq) da Abdal adlı oykonim və oronimlər mövcuddur" (Tapdıqoğlu, 2005: 18).

Verilmiş sitatdan bir daha aydın olur ki, qədim və ortaq Türk adları Laçın rayonuna aid onomastik vahidlərin əsasını təşkil edir.

Laçın rayonu ərazisində qeydə alınmış ortaq Türk adları sırasında Həkəri çayının adı daha önəm daşıyır. Belə ki, bu ad İranda, Türkiyədə, Azərbaycanda və Tacikistanda da qeydə alınmışdır. Ortaq Türk adları içərisində geniş yayılan vahiddir. "Uzunluğu 129 km-dir. Bu çayın adı indiyə qədər həm coğrafi, həm də digər mənbələrdə isə Akarlu, Ankara, Akeri kimi qeyd olunur. Bizə görə, bu çayın adı Türkiyədəki Həkəri mahalının adından götürülmüşdür. Qədim mənbələrdə bu çayın adı Aqvan−Alban şəklində qeyd edilmişdir. Çayın əsl adının Həkəri olması haqqında bəzi subutlar da vardır. Qubadlı rayonu ərazisində Həkərli adda kənd olmuşdur. Bu, vaxtilə buraya Həkəri qəbilələrinin köçüb gəlməsi, kənd salması, bu yeri isə öz tayfalarının şərəfinə adlandırması fikrini söyləməyə əsas verə bilər" (Musayev,Mirzəyev,2004: 44).

Həmçinin XVI−XVII əsrlərdə də bu çayın adının Həkəri olduğunu o dövrdə Laçın rayonunda yaşayıb yaratmış bayatı ustası Sarı Aşiq də bayatılarının birində belə vurğulayır:

Mən Aşiq, ha Kərim
Dada yetiş, ha Kərim
Sənə, sənin gen dünyan
Mənə, mənim Həkərim.

Deyilənə görə Sarı Aşiq İran Hökmdarından saraya dəvət alır və cavabında həmin bayatını söyləyir. Burada Həkərim dedikdə şair açıq aydın elim, obam, ulusum demişdir. Demək, XVI-XVII əsrlərdə Həkəri eli var imiş.

**"Əyrək** oyk. Sadə. Laçın r-nunun köhnə kənd i.ə.v.-da kənd. Qarabağ silsiləsinin yamacındadır. Əyrik, Əkərək, Aqarak, Akarak variantlarında da qeydə alınmışdır. Tədqiqatçıların fikrincə, oykonim mənşəcə Şumer dilinə aid aqar/akar (əkin yeri, əkilən sahə) sözü ilə bağlı olub, "sahibkar mülkü", "sahibkar təsərrüfatı" mənasındadır" (Azərbaycan toponimlərinin ensklopedik lüğəti, 2007: 189).

Burada maraq doğuran odur ki, Həkəri adının qədim ifadə tərzləri verilir və Əkərə adlandığı da qeyd olunur. Bu da yuxarıda öz əksini tapmış və aqar/akar deyimlərinə uyğun gəlir. Yəni Əkərə çayı "əkin yeri", "əkilən sahə"lərin suvarıcısı mənasında, yerin əkərinə uyğun suvarılması üçün yararlı çay mənasını verir. Əkərinə sözü bu gün də dilimizdə işlənir. Məsələn, bu sahəni əkərinə şumlamaq lazımdır. Yaxud da bu işi əkərinə (axarına) salmaq lazımdır. Demək, Həkəri xalis Türk sözüdür. Laçın rayonu ərazisində ortaq Türk adlarının çoxluğu bu diyarın Türk dünyasının bir parçası olduğunu sübut edir.

## Nəticə

Müdriklər deyiblər ki, keçmiş gələcəyin bünövrəsi, gələcək isə keçmişin davamıdır. Keçmişinə sahib çıxmayanlar gələcəyin qurbanına çevrilirlər. Necə ki, biz soy kökümüz olan Alban (qarqar-qıpçaq) dili və ədəbiyyatına sahib çıxa bilmədiyimizə görə ermənilər və gercülər Alban irsini nə varsa mənimsəyib, assimilyasiya edib, özününküləşdirmişlər. Ona görə də dərk etməliyik ki, dünənimiz bu gün üçün bünövrə, gələcək üçün zirvədir. Bünövrəni unutsaq, zirvəni fəth edə bilməyəcəyik. Dünəninə biganə baxanların gələcəyi yoxdur. Gələcək bu günə və keçmişə dirsəklənir. Odur ki, Azərbaycan türkünün də etnik tarixi e.ə. III və I minilliklərə dirsəklənir. Azərbaycanın qədim və erkən orta əsrlərə dair çoxminillik etnik tarixi onun etnogenezi ilə bağlı e.ə. VIII əsrdən etibarən qədim türk, şumer, alban xətti ilə sıralanaraq müasir duruma gəlib çatmışdır. "Azərbaycan xalqının tarixi ümumtürk tarixinin ən qədim və ən zəngin hissəsidir; çünki qədim türklərin ilk dövlət qurumları məhz Azərbaycan ərazisində yaranmışdır. Türk etnoslarının qədim dövrdə və erkən orta əsrlərdə Azərbaycan ərazisində Manna və Maday (e.ə. VIII-VI əsrlər), Sak çarlığı (e.ə. VII-V əsrlər), Atropatena (e.ə. IV eranın III əsrləri), Albaniya (e.ə. IV eranın VII əsrləri) və b. çoxlu dövlət qurumları vardır" (Qeybullayev, 1994: 239).

Ona görə də şair, publisist Gülxani Pənah haqlı olaraq demişdir ki, mən Şumer köklü, İskit soylu, Sak ləyaqətli, Hun əzəmətli, Oğuz nəsilli, Türk əsilli türkəm.

Azərbaycanda qədim zamanlardan etibarən multikultural mühit formalaşmışdır. Bunun nəticəsidir ki, milli adət-ənənə, inanc, musiqi, yemək və əşyalarımız etnik deyil, ümumbəşəri formada qaynayıb qarışmışdır. Lakin bu multikultural münasibətlərə radikal mövqedən yanaşıb şər toxumu səpən erməni adlandırdığımız "dünya şöhrətli işbazlar" kölgə salsalar da, bu anlayışın beynəlxalq əhəmiyyətini azalda bilməyəcəklər. Çünki Azərbaycanda Zərdüştlük, Yəhudilik, Dağ yəhudiləri, Avropa yəhudiləri (aşkenazilər), Xristianlıq, Pravoslavlıq, Katoliklik, Protestantlıq və İslam dininin geniş yayılması ölkəmizin tolerantlıq mədəniyyətini və Azərbaycanın mədəniyyətlərin qovşağında yerləşməsi amilini şərtləndirir.

Azərbaycanın ulu keçmişi Qafqaz Albaniyasında qədim Alban məbədləri bütün xristian dünyasında ən qədim kilsələrdir və apostol mənşəlidir. Odur ki, Qafqaz Albaniyasının ərazisi ilk xristian icmalarının meydana gəldiyi məkandır. Bu məsələni Moisey Kalankatuklu "Alban tarixi" əsərində də qeyd etmişdir. Məlumat vermişdir ki, Albaniyada eramızın II yüzilliyindən başlayaraq ilk xristian icmaları yaranıb, IV yüzilliyin I rübündə (313-cü ildə) isə Alban çarı Urnayr Xristianlığı dövlət dini elan edib. İlk xristian apostol kilsəsi Qafqaz Albaniyasında təsis olunub. Hətta xristianlığın banisi İsa Məsihin anadan olması münasibəti ilə Şərqdən (Ə.Ə.Albaniyadan) Qüdsə gəlib ona səcdə qılıb, hədiyyələr təqdim edən də ilk dəfə şərqlilər (albanlar) olmuşlar. Bu haqda "İncil"də belə yazılmışdır:

1.İSA padşah Hirodun günlərində, Yəhudeya Beytlehemində anadan olan zaman, Şərqdən Yeruşalimə münəccimlər gəlib dedilər:

2."Anadan olan yəhudilərin Padşahı haradadır? Çünki, Onun ulduzunu Şərqdə gördük və Ona səcdə qılmağa gəldik."......

11.Evə gəlib anası Məryəm ilə Körpəni gördülər və yerə qapanıb, Ona səcdə qıldılar. Xəzinələrini açaraq Ona hədiyyələr, qızıl, günnük və mirra təqdim etdilər" (İncil, 1993:13).

Buradan bir daha aydın olur ki, təqdim olunan hədiyyələr dəyərli olmaqla yanaşı, Şərqin də rəmzini əks etdirir. Günnük gün ölkəsinin (Şərqin) simvoludur. Gündən qorunmaq vasitəsidir.

VII əsrin II yarısından etibarən Xristianlıq tədricən mövqeyini itirib, 705-ci ildə Alban dövləti süquta uğrayıbdı. Albaniyanın Aran (düzən) ərazilərində məskunlaşan əhali İslam dinini qəbul edərək müsəlmanlaşıb, Kiçik Qafqazın cənub-qərbində yaşayan albanlar monofizit erməni qriqoryan dininin təzyiqi altında erməniləşib, Kiçik Qafqazın şimal-şərq ərazisinin albanları isə diofizit gürcü-pravoslav kilsəsinin təzyiqi ilə gürcüləşibdi. Amma Udinlər isə Alban etnosunun bir tayfası kimi bu gün də Oğuz və Qəbələ rayonlarında öz etnik xüsusiyyətlərini qoruyaraq yaşayırlar.

Qədim və zəngin olan Azərbaycan elə bir unikal tarixi məkandır ki, burada yüzlərlə etnos pərvəriş tapmış və hər bir etnosun dünyaya baxış fəlsəfəsi formalaşmışdır. Azərbaycanın güclü olmasının bir səbəbi də buradan qaynaqlanır (Qeybullayev, 1994: 234-235).

Bəşər övladı eyni həyat qazanında bişib, cilalanıb formalaşmışdır. Demək, bizim dövrümüz çoxəsrlik dünya qazanında bişmiş sinxronok bir aləmdir. Biz bu aləmdə şamanlıq, büdpərəstlik, ümumiyyətlə, hər bir şeyə tapınma, xristianlıq, islamçılıq və s. inancları görə bilərik. Tarixin inkişaf xətti və fəlsəfi duyumu imkan verir deyək ki, bəşər övladının beşiyi və məzarı, inam və inancları eyni nöqtədə birləşir və bu labüddür. Çünki bəşər övladının başlanğıcı və sonu eyni nöqtədə dərk olunur. Odur ki, tolerantlıq, multikulturalizm bəşər övladının ali dərketmə hissidir, dinc birgəyaşayış ənənəsinə sadiqlik, qarşılıqlı hörmət və ehtiram duyğularına dayanıqlılıq zirvəsidir. Buna görə də Azərbaycanda ayrı-ayrı etnosları xalq "din ayrı qardaş" adlandırır. Eyni atmosferin havasını udan, eyni torpaqdan, sudan qidalanan bəşər övladı (varlıqla yoxluq fəlsəfəsinə söykənən insan) ayrı-ayrı hissələrin tam varlığıdır. Buna görə də radikalizmə son qoyulmalıdır. Bütün dünyanı təhlükə altına alan dini radikalizm və terror bəlasının yüksək dərəcədə qorxulu və dəhşətli olduğunu nəzərə alan Azərbaycan Prezidenti İlham Əliyev 2016-cı ili "Multikulturalizm ili" elan etməklə bəşəriyyətə həyəcan dolu mesaj göndərmişdir (Cəfərsoy, 2010: 14).

Azərbaycan türk millətinin dövlətçiliyi, dili və mədəniyyətinin tarixi vərəsəsi e.ə. IV eramızın VII əsrinə qədər mövcud olmuş Albaniya dövləti, Alban (qarqar-qıpçaq) dili və Alban mədəniyyəti olmuşdur. Odur ki, "Azərbaycan türk dilinin birbaşa sələfi Atropatena və Alban ümumxalq danışıq dilidir. Mannada və Midiyada tayfa ittifaqları xalqa çevrilmədiyinə görə ümumxalq danışıq dili də yarana bilməzdi. Ona görə təxminən eyni tarixi mərhələ çərçivəsində yaranmış bu dillər Azərbaycan dilinin

bünövrəsini təşkil edir. Alban tarixçisi Musa Kalankatuklunun çar vaçaqanın (V əsr) bütün əyalətlərə fərmanlar göndərməsi haqqında məlumatından (I kitab 20-ci fəsil) aydın olur ki, Albaniyada ümumxalq danışıq dili vardı. Alban dili həm də V-VII əsrlərdə yazılı dilə malik idi. Mənbələrdə qeyd olunur ki, "Bibliya" Alban dilinə tərcümə olunmuşdur. Bu onu göstərir ki, Alban dili "Bibliya" kimi kitabın dilini verməyə qadir lüğət fonduna malik dil idi. Bilirik ki, ərəblərin Azərbaycanı işğal etməsilə Alban etnosu dini mənsubiyyətcə parçalanmış, VIII əsrin əvvəlində xilafətin köməyi ilə erməni kilsəsi Alban kilsəsini özünə tabe etmişdi. Bu Alban yazısının məhvinə səbəb olduğu kimi, Alban danışıq dilinə də zərbə vurmuşdu. Əslində ümumxalq Alban danışıq və yazılı dilinin tarixi bununla bitir və VIII əsrdən sonra Albaniya və Atropatenada türk tayfalarının Albanların müsəlman hissəsi və atropatenlilərlə konsolidasi-yası yeni etnosun-Azərbaycan etnosunun formalaşmasına səbəb olmuşdur (Tapdıqoğlu, 2007). Böyük Nizami və Xaqani məhz Albaniya ərazisində əsrlər boyu formalaşmış mədəni irsi və formalaşmış dili əhatə edən özül üzərində yüksəlmişdi Nizami etnik mənsubiyyətcə türk idi və onun ana dili də albanların türk dili idi. Məlumdur ki, Nizami qıpçaq qızı ilə evlənmişdi. Yəqin ki, həmin qız nə ərəb, nə də farsca bilmirdi. Nizami türk deyildisə (XI-XII əsrrlərə qədər Alban əhalisinin Qafqazmənşəli olmasını söyləyən tarixçilərimizin ardınca getsək) türk qızı ilə necə ailə qura bilərdi?! Belə aydın məsələləri də bəzi tədqiqatçı tarixçilərimizə başa salmaq olmur....

Oğuzların dili yazılı dil idi. Hələ orta Asiyada onların dilində əsərlər yaranmışdı. "Kitabi-Dədə Qorqud"un dili həmin oğuzların dili ilə yerli alban-atropaten dillərinin konsolidasiyası prosesinin nəticəsində təşəkkül tapmış dil idi. Lakin Qətran Təbrizinin, Nizaminin, Xaqaninin və ümumiyyətlə, XIII əsrə qədər yazıb yaratmış Azərbaycan şairlərinin dili oğuzların gəlişinə qədərki ümumxalq danışıq dili idi". Bir daha aydın olur ki, Alban dili və mədəniyyəti birmənalı şəkildə Azərbaycan türkünün vərəsəsi, bünövrəsi və köküdür. Bütün nəticələri bizə bəyan edən dil faktları olduğu üçün Azərbaycan dilinin vərəsəsinin kim olması da maraq doğurur. Odur ki, bu məsələni diqqətə çatdırmağı önəmli saydıq (Azərbaycan tarixi üzrə qaynaqlar, 1989).

Mötəbər mənbələrə və real tarixi faktlara dirsəklənib doğru, dəqiq nəticələr əldə edən f.e.d. İlhami Cəfərsoy Yusif oğlu "Türk dillərində teonim və etnonimlər" əsərində sübut və dəlillərlə bu nəticəyə gəlmişdir ki, etnonimlər aşağıda qeyd olunmuş qaydada yaranmışdır:

"-- Tanrı adlarından yaranan etnonimlər:

---Tanrı elçilərinin adlarından yaranan etnonimlər,

---Ruhların adları əsasında yaranan etnonimlər,

---Səma cisimlərinin ilahiləşdirilməsi nəticəsində yaranan etnonimlər,

---Yer cisimlərinin və təbiət hadisələrinin adları əsasında yaranan etnonimlər,

---Tanrı bəxşişlərinin adlarından törəyən etnonimlər".

Tarixi faktlardan biri də budur ki, etnoslar məskunlaşdığı əraziləri öz daşıdığı etnik adla adlandırmaqla tarixin yaddaşına toponimləri həkk etmişlər. Odur ki, qədim Türk, Şumer, Alban etnoslarının etnik adları müasir dövrümüzdə Azərbaycan məkanında qeydə alınması bu yerlərin əcdadlarımıza məxsus olduğunu sübut edən dəlillərdir. Qədim Türk boylarının adlarını özündə əks etdirən onomastik vahidlərə aşağıdakı nümunələri göstərə bilərik:

---Qarqar (Qu quşuna tapınanlar)-----Qarqar şayı, Qarqar düzü.....

---Qord (Ərvahı qurd olanlar)-----Qurdqajı, Qurdlar kəndləri......

---Bərdək (Bərdə şəhərini salanlar)-----Bərdə şəhəri.....

---Gəncək (Gəncə şəhərini salanlar)-----Gəncə.....

---Alıncak (Əlincə qalacını salanlar)-----Əlincə qalası.....

---Uruz(Araz)-----Araz çayı, Ərəş mahalı.....

---Alp Uruz-----Elbrus zirvəsi, Elbrus dağları.....

---Bel, Mil (Şumer tanrısı)-----Beyləqan şəhəri,Mil düzü, Milli kəndləri.....

---Qara Bel (Qaravəlli)-----Qaravəlli kəndləri.....

---Ağ Bel-----Quba qəzasında Ağbil kəndi qeydə alınmışdır.....

---Su (Suya sitayiş edənlər)-----Ağsu, Qarasu, İlisu, Sarısu yer adları.....

---Çay (Çay tanrısına tapınanlar)-----Göyçay, Çaylı.....

---Bayan-----Bayan kəndləri.....

---Bayat-----Boyat kəndi.....

---Bum (Mağaraya tapınma)-----Qəbələdə Bum kəndi, Bum çayı.....
---Sel (Selə tapınma)-----Ağdamda Şelli kəndi.....
---Daş (Daşa tapınma)-----Laçında ər daşın evi, yəni Ərdəşəvi.....
---Dəmir (Temir)-----Bərdədə Qaradəmirçi kəndi.....
---Alpavut-----Laçında, Bərdədə Alpoud kəndləri.....
---Kasa (Cam)-----Laçında, Şuşada Kosalar kəndləri.....
---Kılıclı-----Laçında, Bərdədə Qılıclı kəndləri.....
---Quşçu-----Laçında, Şuşada Quşçu kəndləri.....
---Boz Doğan-----Laçında Bozdağan kəndi.....
---Sarıca-----Sarıcalı kəndləri.....
---Xaçın-----Xaçın çayı, Laçında Xaçınyalı kəndi.....
---Sona-----Laçında Sonasar kəndi.....
---Tərtər-----Tərtər çayı.....
---Ardıc-----Laçında Arduşlu kəndi.....
---Tal (dal---budaq, ağaca tapınma)-----Talış kəndi.....
---Budaq-----Laçında Budaqdərə kəndi.....
---Kəngərli-----Kəngərli kəndləri.....
---Karabak /Ağbak (Bütə tapınma)-----Qarabağ.....
---Getabak (Bütə tapınma)-----Gədəbəy.....

Göstərilən misallardan bir daha aydın olur ki, Azərbaycan ərazisi qədim Türk uluslarının yaşayış məskəni, Oğuz yurdu olmuşdur.

## Ədəbiyyat

1. Qeybullayev, Q. (1994). Azərbaycan türklərinin təşəkkülü tarixindən. Bakı.
2. Cəfərsoy, İ. (2010). Türk dillərində teonim və etnonimlər. Bakı.
3. Tapdıqoğlu, N. (2005). Şəmkir rayonu və onun toponimiyası. Bakı.
4. Gəncə-Qarabağ əyalətinin müfəssəl dəftəri. Bakı. 2000.
5. Azərbaycan toponimlərinin ensklopedik lüğəti. (2007). 2 cilddə. Bakı.
6. İsmayılov, P. (2012). Kəlbəcər rayonunun yer-yurd adları. Bakı.
7. Musayev, M., Mirzəyev, M. (2004). Türk dünyası. Bakı.
8. Axundov, A. (1983). Torpağın köksündə tarixin izləri. Bakı.
9. Nizami Gəncəvi. (2004). Xosrov və Şirin. Bakı.
10. Nizami Gəncəvi. (2004). İsgəndərnamə (Şərəfnamə). Bakı.
11. Tuncay, B. (2010). Qafqaz Albanlarının dili və ədəbiyyatı. Bakı.
12. İncil. (1993). Bibliya Tərcümə İnstitutu.
13. Kalankatuklu, M. (1993). Albaniya tarixi. Bakı.
14. Qeybullayev, Q. (1992). Qədim Türklər və Ermənistan. Bakı.
15. Fərzəli, Ə. (1999). Dədə Qorqud sözü. Bakı.
16. Cəfərsoy, İ. (1995). Türklər rusların soy kökündə. Bakı.
17. Cəfərsoy, İ. (2005). Sibirdə Təbriz şəhəri. Bakı.
18. Fərzəli, Ə. (1999). Dədə Qorqud yurdu. Bakı.
19. Kitabi-Dədə Qorqud. (2004). Bakı.
20. Abışov, E. (2007). El-oba adlarının izi ilə. Bakı.
21. Tapdıqoğlu, N. (2005). Laçın rayonu və onun toponomiyası. Bakı.
22. Tapdıqoğlu, N. (2007). Ağcabədi Ensiklopediyası. Bakı.
23. Azərbaycan tarixi üzrə qaynaqlar. (1989). Bakı.

Göndərildi: 19.01.2021 Qəbul edildi: 13.03.2021

DOI: 10.36719/2706-6185/03/23-28

**Mehriban Zeynal qızı Hacızadə**
Azərbaycan Dillər Universiteti
farizhacizade720@gmail.com

# MÜASİR DİLÇİLİKDƏ SÖZ BİRLƏŞMƏSİNİN ROLU VƏ YERİ

**Xülasə**

Müasir ingilis dilində söz birləşmələrinin rolu və yeri zaman-zaman tədqiqat obyekti olmuşdur. Söz birləşmələri ilə bağlı araşdırmalar göstərir ki, əksər hallarda sərbəst söz birləşmələri ilə frazeoloji birləşmələr arasında heç bir fərq yoxdur. Söz birləşmələri arasındakı fərqə gəlincə, biri dildə hazır, digəri isə nitq prosesində formalaşır.

Sözlərin nitq prosesində birləşməsinin əsas səbəbi ifadə etdikləri anlayışların bir-biri ilə əlaqəli olmasıdır.

Beləliklə, söz birləşmələrinin əsasını ifadə etdikləri anlayışların qarşılıqlı uyğunluğu təşkil edir.

Söz birləşmələrinə məşhur yanaşma xarici və doğma dillərdə sözlərin mənalarını müqayisə etməkdir.

***Açar sözlər:*** *söz birləşməsi, nitq prosesi, məfhum, kateqoriya, tipologiya*

**Mehriban Zeynal Hajizade**
Azerbaijan University of Languages
farizhacizade720@gmail.com

## The role and place of word combination in modern linquistics

**Abstract**

The role and place of word combinations in modern English has been the subject of research from time to time. Research on word combinations shows that in most cases there is no difference between free word combinations and phraseological combinations. As for the difference between word combinations, one is ready in the language, and the other is formed in the process of speech.

The main reason for the combination of words in the speech process is the interconnectedness of the concepts they express.

Thus, the basis of word combinations is the mutual compatibility of the concepts they express.

A popular approach to word combinations is to compare the meanings of words in foreign and native languages.

***Keywords:*** *word combination, speech process, concept, category, typology*

## Giriş

Qeyd edək ki, ilkin elmi anlayışların inkişaf mexanizmi "müəyyənləşdirmə metodu" vasitəsilə reallaşdırılır. "Bu metodun əsasını artıq hazır şəkildə olan, uşaqda artıq formalaşmış anlayışları, onların məzmununu şifahi şəkildə müəyyənləşdirməklə tədqiq etməkdən ibarətdir" (Vygotsky, 1934: 103).

Ancaq sözü gedən metod faktiki olaraq məfhumların təkamül prosesini müəyyənləşdirə, anlayışların əsas əlamətlərinin fərqləndirilməsinin həqiqətən də şüurlu şəkildə və dərketmə yolu ilə baş verib-vermədiyini göstərə bilmir.

L.S.Vıqotskiy yazır ki, "anlayışların tədqiqi işində irəliyə atılmış ən böyük addım anlayışların yaranma prosesini adekvat şəkildə təsvir etməyə cəhd göstərmiş eksperimental metodikanın yaradılmasından ibarət olmuşdur (Vygotsky, 1934: 104).

L.S.Vıqotski anlayışları adi və elmi olmaqla iki qrupda təsnifləndirir. Onun fikrincə, adi və elmi anlayışların əsas fərqi anlayışların mənimsəmə metodlarında özünü büruzə verir.

Belə ki, adi anlayışlar şüursuz şəkildə aşağıdan yuxarıya, elmi anlayışlar isə yuxarıdan aşağıya olmaqla mənimsənilir (Vygotsky, 1934: 104).

Anlayışların formalaşması istiqamətində aparılmış araşdırmalar arasında L.S.Vıqotski, L.S.Saxarov metodu ilə aparılmış eksperimentlər böyük maraq kəsb edir.

Başqa sözlə, "süni anlayışlar"sınaqdan keçirilir. L.S.Vıqotskiy "eksperimental anlayışların araşdırılmasından həqiqi anlayışların dərindən araşdırılmasına keçməyin" zəruriliyini bildirirdi. L.S. Vıqotskinin və digər tədqiqatçıların araşdırmaları göstərir ki, məktəbəqədər yaş dövrünə mənsub olan uşaqlar anlayışları fikirləşmək qabiliyyətinə malik deyil (Vygotsky, 1934: 108).

N.F.Talizinanın qənaətincə, fəaliyyətin təxmini əsaslarının birinci tipinə yalnız "fəaliyyət nümunələri" və onun məhsulları daxildir. Öyrənci özü hərəkəti yerinə yetirmək üçün cəhdlər və səhvlər yolu ilə oriyentirlər axtarır. Hərəkətin düzgün yerinə yetirilməsi şərti, bir qayda olaraq, müəllim tərəfindən nəzərdə tutulur (Talyzina,1975: 55).

Sözlərin birləşmə imkanları dedikdə onların birləşmə imkanları və söz birləşməsi məfhumunun linqvistik təbiətini əlində əsas götürən çətinlik kateqoriyalarının təqdim etdiyi söz birləşmələrini tədqiq etməkdir. Leksikanın mənimsənməsi üçün əsas tələblərdən birinin sözləri kombinə etmək bacarığının olduğunu qeyd edərək, ingilis dilində sözlərin semantik xüsusiyyətlərinə, digər sözlərlə məna münasibətlərinə, sözün morfoloji və sintaktik formasına əsaslanmaqla söz birləşməsi vasitəsilə cümlə tərkibinə daxil olduğundan, sözlərin leksik, morfoloji və sintaktik birləşmələrini qeyd edir. Bununla əlaqədar sözlərin mənimsənməsinə dair çətinlikləri 2 kateqoriyaya bölürlər. Birinci kateqoriyaya aid olan çətinliklər sözün mənsub olduğu nitq hissəsinin xüsusiyyətləri ilə bağlıdır. İkinci kateqoriyaya dair çətinliklər isə sözün mənası və onun müəyyən sözlərlə birləşə bilmək imkanları ilə əlaqədardır (Talyzina, 1975: 45). Sintaktik konstruksiyalarda isə sifətlərlə birləşmə imkanlarına üstünlük verirlər. Bu zaman tədqiqatçıların marağı ana dilindəki ekvivalentlərin üzərində cəmləşir. Bu fikirlər fransız dilinin tədrisi üçün əhəmiyyətli ola bilər. Tədqiqatçı alimlər xarici dildə söz birləşmələrini iki qrupda müəyyənləşdirirlər:

1. Birinci qrupa qavranılması öyrənənlər üçün xüsusi cəhd tələb etməyənlər

**Məsələn: "many books, a beautiful girl, a good picture" və s. kimi söz birləşmələri aiddir.**

**2. İkinci qrupa isə doğma və xarici dildə sözlərin işlənmə məqamlarının üst-üstə düşməsi ilə əlaqədar çətinlik törədən söz birləşmələri**

**Məsələn: To marry somebody, strong feeling, lonely business, big argument, big affair, to take to smb.) aid edilir.**

**Q.İ.Boqin söz birləşmələrinin tipologiyasını verərkən daha geniş tədqiqatlara yer vermişdir (Bogin, 1967: 45). O, söz birləşmələrini:**

**1. söz**

**2. forma seçimi**

**3. söz əlaqələri (1-ci qrup)**

**4. nitq prosesində hazır material kimi işlədilən sözlərin işlənməsi ilə bağlı (2-ci qrup) çətinlik səviyyəsi ilə bağlı olaraq təsnifləndirir.**

**Hər iki qrupa semantik sıralanma (1-ci qrup üçün lazımı sözün seçilməsi, misal üçün, little-big) və ya 2-ci qrup üçün sözlərin söz birləşmələri tərkibində idiomatik işlənməsi (məsələn, for the first time, in his time) eləcə də, strukturda** olan çətinliklərlə bağlı, 1-ci qrup üçün strukturun seçilməsi (**my sister and I**), ekvivalenti rus dilində ayrı-ayrı sözlərlə ifadə olunan ingilis dili birləşmələrinin (məsələn, **to take a look**) işlənməsi daxildir və iki yarımqrupa bölünür. Xarici dil fakültələrində frazeoloji vahidlərin tədrisi ilə bağlı söz birləşmələrinin metodik tipologiyasının işlənib hazırlanması T.N.Lyapina və E.F.İvanovaya məxsusdur.

Söz birləşmələrinin dildaxili və dillərarası interferensiyanı nəzərə almaqla yaradılmış metodik tipologiyası E.F.İvanova tərəfindən həyata keçirilmişdir.

Tədqiqatçıların hər ikisi daxili interferensiya baxımından söz və söz birləşmələrini iki qrupda təsnifləndirir: (Axundov, 2006: 280).

1. Birinci qrupa istifadəsi müəyyən qaydalarla əlaqədar ingilis dilinin artıq mənimsənmiş hadisələri ilə üst-üstə düşməyən söz və söz birləşmələri daxildir. Həmin söz birləşmələrinə mənimsənilmə çətinlikləri hərəkət bildirən müxtəlif cümlələrin (**to arrive in, at; to leave for**) işlənməsi ilə bağlı olan söz birləşmələri aiddir (1-ci qrup).

2. Mənimsənmə çətinlikləri dillərarası interferensiya ilə izah olunan söz birləşmələrinə isə məna baxımından uyğunluq təşkil etməyən söz birləşmələri aid edilir (2-ci qrup).

T.N.Lyapina 4-cü kursda mənimsənməsi vacib olan leksikanı A və B yarımqruplarında qərarlaşdırır.

1. A yarımqrupuna uyğunluğa əsaslanan sözlər daxildir (məsələn **"radical"**).

2. B yarımqrupuna isə ingilis dilinin öncə mənimsənmiş sözləri ilə uyğunluq əsasında anlaşılan sözlər daxildir (misal üçün, **"attack"**).

Qeyd edilir ki, burada çətinlik törədən əsas səbəb uyğunluq təşkil etməyən sözlərdir. Eyni zamanda, əsas diqqət "konstruktiv" birləşmə imkanlarında cəmləşir. Frazeoloji vahidlərə isə fikir verilmir. Sözlərin birləşmə imkanlarının uyğunluq təşkil etməməsini aşağıdakı misallarla qeyd etmək mümkündür:

İngilis və Azərbaycan dillərində tipoloji tədqiqatlardan bəhs edərkən Z.N.Verdiyeva, N.A. Ələkbərova, O.İ.Musayevin və s. işləri diqqət çəkir. Sözlərin birləşmə imkanları ilə bağlı məfhumların araşdırılması ilə bağlı tədqiqat müəlliflərindən S.K.Folomkina, Z.M.Tsvetkovanın adlarını çəkmək olar. Onlara görə **"heavy rain"** və **"сильный дождь"** birləşmələrinin müqayisəsi zamanı müxtəlif anlayışlar formalaşır: ruslar yağışı gücünə, ingilislər isə ağırlığına və intensivliyinə görə qiymətləndirirlər. Azərbaycan dilində **"heavy rain"** söz birləşməsinin ekvivalenti olan **"şiddətli yağış"** birləşməsində yağışın gücü və intensivliyi vurğulanır. Beləliklə, burada ingilis dilindən çox, rus dili ilə daha çox oxşarlıq mövcuddur. Frazeoloji leksik vahidlər didə işlənmə baxımından üstünlük təşkil etdiyi üçün onların öyrənilməsinin vacibliyini vurğulayan S.K.Folomkina dərk olunması, yadda saxlanılması və yada salınması ilə bağlı onların üç mərhələdə öyrənilməsinin konkret yollarını göstərir (Folomkina, 1959: 22).

Müəllif dərk olunma mərhələsində frazeoloji vahidlərlə bağlı çalışmaların aşağıdakı növlərini qeyd edir:

1) Söz birləşmələri ilə əlaqədar söz seçimi;
2) rus dilində ekvivalentlərin seçimi;
3) ingilis dilindəki söz birləşmələrinin rus dilinə tərcüməsi;
4) ingilis və doğma dildə sözlərin birləşmə imkanlarının müqayisəsi;
5) cümlələrin təhlili və s.

II qrupa cavabları mətndə dəqiqliklə verilən suallar aid edilir. Bu növ suallara ingilis dilində **"wh questions"** - yəni **"who, when, where, what"** sual sözləri ilə başlayan xüsusi suallar aiddir. Lakin xüsusi sualların heç də bütün növləri bu qrupa aid edilə bilməz. Belə ki, **"why" and "how"** sual sözləri ilə başlayan xüsusi suallara dəqiq cavabların verilməsinin mümkün olmadığı səbəbindən, bu növ suallar sözü gedən suallar qrupuna daxil edilə bilməz:

What is always there in English conversation?

Verilən sual aşağıdakı şəkildə cavablandırılmalıdır:

• An undercurrent of humour.
• There is always an undercurrent of humour.
• There is always an undercurrent of humour in English conversation.

III qrupa cavabları mətnin məzmunundan götürülən, lakin cavabların mətndə dəqiq şəkildə olmayan suallar aiddir. Adətən bu qrupa aid olan suallar **"why"** and **"how"** sual sözləri ilə başlayır.

• How did Dick get acquainted with his wife?
• When people get different favours for each other?

Bu cür sualların adətən dəqiq cavabı olmur. Məzmunu bilən tələbələr suallara yaradıcılıqla yanaşırlar.

IV qrupda isə maksimum yaradıcı cavablar tələb olunur. Bu zaman verilən sualların cavabları izah olunmur. Tələbələrə suallara cavab verərkən fikir və rəylərini ifadə etmək, fərziyyə bildirmək tapşırılır.

V qrupda isə artıq onlar mövqe nümayiş etdirməli, əlavə məlumatlarla "silahlanmalı" və təcrübələrindən istifadə etməlidirlər. Bu zaman aşağıdakı suallar ünvanlana bilər:

• What would you get in Dick's place?

Dördüncü və beşinci qruplarla bağlı suallar əksər hallarda dərsliklərdə qeyd olunmur.

Belə hesab edirik ki, dərslik müəllifləri bu cür sualların yazılı surətdə cavablandırılmasının çətin olduğunu düşünərək dərsliklərə daxil etmirlər. Problemin həlli məfhumların ifadə olunmasına xidmət

edən "**to get**" tərkibli frazeoloji vahidlərin linqvistik mövqedən müəyyənləşdirməyə imkan verən söz birləşməsinə yanaşma tərzlərinə istiqamətlənmişdir.

Bunlardan V.Q.Admoni, O.S.Axmanova, V.V.Vinoqradov, A.V.Kunin, A.A.Potebnya, A.A. Şaxmatov, N.Y.Şvedova, V.N.Yartseva və b. təhlildə onun üç mərhələsinin (fiziki, qiymətləndirici, eləcə də, məcazi mənalı söz birləşmələrinin araşdırılması ilə bağlı maraqlı ideyalara malik idilər. Frazeoloji birləşmələrin nitq prosesində yaranması, başqa sözlə, onların dilə deyil, daha çox nitqə aid olması fikrinin təsdiqi linqvistik nöqteyi-nəzərdən önəmli əhəmiyyət kəsb edir.

İngilis və Azərbaycan dillərində sözlərin məna strukturları bir-birindən əhəmiyyətli dərəcədə fərqləndiyinə görə, dillərarası və dildaxili interferensiya burada nəzərə alınmalıdır.

Frazeoloji birləşmələrin tədrisinin və öyrənilməsinin ilkin psixoloji şərtləri qismində aşağıdakıları bilmək lazımdır:

a) anlayışın məzmun və həcminin müəyyənləşdirilməsi;

b) anlayışların məzmunu arasında məna əlaqələrinin yaradılması çıxış edir.

Sözü gedən psixoloji mexanizmin hazırlanması vacibdir. Hər bir cümlə nitqin kontekstual vəziyyəti ilə bağlı olur. Kontekstdən xaricdə götürülmüş cümlənin intonasiyası həmin cümlənin birinci növbədə daxili üzvlərinə bölünməsini təmin edir. Bu üzvlərin söz birləşmələri, tərkiblər və s. şəklində formalaşması, xüsusən, budaq cümlə ilə tərkiblərin fərqləndirilməsində intonasiya mühüm rol oynayır, müxtəlif qrammatiк, sintaktik-semantik əlaqələrin nəzərə çarpdırılmasına kömək edir.

Q.Q.Poçepsov yazır: «Cümlə quruluşunun öyrənilməsi, onun tərкibinin parçalanması, tərкib hissələrinin üzvlənməsi zərurətini meydana çıxarır» (Aidarova, 1964: 9).

Cümləni və başqa nitq vahidlərini, eləcə də frazeoloji vahidləri səslənmə prosesindən xaricdə təsəvvür etmək mümkün deyil.

Müasir ingilis dilində cümlə üzvlərinin tema kimi çıxışında, müəyyən məna çalarlarına malik olmasında məqsəddən asılı olaraq, müxtəlif mövqedə olması intonasiya xüsusiyyətlərində özünü göstərir. Müasir dilçilikdə müxtəlif cümlə tiplərinin, habelə sintaqm təşkil edə bilən cümlə üzvlərinin, frazeoloji vahidlərin intonasiya baxımından tədqiqi maraq doğurur.Frazeoloji birləşmələr də söz birləşmələrinin bir növü kimi nitqimizdə mühüm yerə sahibdir. İzahedici sözləri öz ətrafında birləşdirən bu birləşmələr həlledici rola malikdir.

Müasir Azərbaycan dilində feli bağlama tərkibləri, ingilis dilində onlara müvafiq feli-sifət və cerund tərkiblərinin bir sıra sözlərdən ibarət olması, bu sözlər arasında məna və qrammatik əlaqələrin mövcudluğu, tərkibdəki ayrı-ayrı sözlərin müstəqil məna daşımaları və sintaktik vəziyyətlərinə görə fərqlənmələri göstərir ki, bu vahidlər maraqlı quruluşa malikdir.Onların müxtəlif məna növləri içərisində özünü daha kəskin büruzə verəni və feli bağlama tərkibləri mənasının əsas mahiyyətini təşkil edəni onların nisbi zaman anlayışı ifadə etməsidir. Eyni zamanda frazeoloji vahidlərlə birlikdə işlənməsi də bu tərkiblərin sanballılığını artırır.

Ona görə də bu tərkiblərin məna növlərindən danışarkən birinci növbədə onların zaman anlayışı ifadə etməsi diqqəti cəlb edir. Feli bağlama tərkiblərinə daxil olan sözlərin hamısı həmin tərkibin feli bağlamasına aid olub, onu bu və ya başqa cəhətdən izah edir, ya da ona aid müəyyən bir əlamət bildirir. Deməli, sadə geniş cümlədə bu vahidlər əksər hallarda cümlənin əsas predikativ hissəsinin ifadə etdiyi məlumatdan daha çox və mühüm bir məlumat ifadə edir.

***Lady's only relaxation was to get up after she had sewed the dinners and have a little chat with her gentleman»*** (Xanımın yeganə rahatlığı təşkil etdiyi naharı yola vermək və öz cənabı ilə bir az söhbət etməsi idi) (Making It All Right, 1978: 5)

Verilən cümlə öz dinamik və zəngin semantikası ilə diqqət çəkir. Belə ki, burada məişət və həyat tərzi ilə bağlı semantik xüsusiyyətlər ön plandadır. Onu da qeyd edək ki, adı çəkilən vahidlər əksər hallarda cümlənin əvvəlində vurğulu, ortasında və ya sonunda vurğusuz olurlar. Təsdiq məqamında işlənmiş bu cümlələr enən tonla sərhədlənərək «**only**» sözünün köməyilə güclü dinamik vurğu ilə tələffüz edilir, söz özü modal zonaya daxil edilir. **«Only»** ədatı prepozisiyada işlənərək, kommunikativlik cəhətdən böyük əhəmiyyət kəsb edir.

Aşağıdakı cümlələr inkar məqamında işlənərək qalxan tonla hüdudlanır, formal-qrammatik element məntiqi vurğu ilə deyilir.

***Getting his club at last he stopped to buy a paper*** (Kluba yaxınlaşanda, nəhayət o qəzet almaq üçün dayandı) (Making It All Right, 1978: 81).

Bu cümlədə frazeoloji vahid vasitəsilə məsafə, məkan semantik məna çaları müəyyənləşmişdir.

Birinci cümlədə feli bağlama tərkibləri ilə ifadə olunmuş müstəqil həmcins zərfliklər tabesizlik əlaqəsi əsasında əlaqələnərək, müstəqil sintaqmlar yaradır. Hər iki cümlədə feli bağlama tərkibləri cümlələrin əsas predikativ hissəsinə əlavə olunub, hərəkətin nə zaman, harada, hansı şəraitdə baş verdiyini ifadə edir. Bəzi frazeoloji vahidlərdə formal-qrammatik elementlər, modal sözlər, qoşmalar, bağlayıcılar və s. işlədilərək onların mənasına təsir edə bilmir, ancaq vahidlərin ifadə etdiyi məna növlərinin qabarıq nəzərə çatdırılmasında vasitə olur. Yuxarıdakı cümlələrdə **nəhayət, at last** modal sözlərinin işlədilməsindən bunu aydın görmək olar.

***"Entering, he had noticed that several people were get already seated at little round green tables with little pots of fresh flowers on them and Brittany ware plates".*** (İçəri daxil olanda, üzərində tər çiçək dibçəkləri və dəmir Britaniya boşqabları olan kiçik stolların ətrafında bir neçə adamın artıq oturduğu onun nəzərindən qaçmadı) (Making It All Right, 1978: 35).

Belə halda onlar ayrıca bir sintaqm təşkil edir. Bu zaman səsin əsas tonu orta yüksəkliyə qalxır və sintaqmatik fasilə edilir. **"To get"** tərkibli frazeoloji vahidlər arasında məntiqi-qrammatik cəhətdən maraq doğuranı heç bir uzlaşma baş vermədən, hərəsi öz mövqeyinə xidmət edən tam inkişaf etməmiş vahidlərdir. Yuxarıdakı cümlədə frazeoloji vahid vasitəsilə məlumatın ötürülməsi, məqsədə çatma semantik məna çaları yaranmışdır.

Aşağıdakı cümləni nəzərdən keçirək:

***"Greeting Soames deferentially, he got the key in the only door with a certain ostentation"*** (Somsu fərqli salamlayaraq, o əminliklə yeganə qapıda açarı fırladı) (Making It All Right, 1978: 124).

Burada sözü gedən frazeoloji vahidin nəyisə əldə etmə, məqsədə çatma kimi məna çaları baş verir. İngilis dilindəki **/ Oh / my Lord / I can't get you/** cümləsində xitab sintaktik vahidin ortasında gəlir və onu üç sintaqma bölür. Birinci sintaqmında orta heca sürəti, ikinci sintaqmında orta ton tezliyi, üçüncü sintaqmda isə bu göstəricilər müxtəlifdir.

Təhlil olunan ingilis dilindən seçilmiş / ***They couldn't get him from greeting with her//***cümləsində orta ton tezliyi, orta intensivlik qiyməti, orta tələffüz sürəti müxtəlif qiymət göstəricilərinə malikdirlər.

***They couldn't get him from meeting with her //*** cümləsində maksimum akustik göstəricilər başlanğıc fazada qeydə alınmışdır. Semantik cəhətdən məna çalarına gəldikdə burada məqsədə çatma semantic məna çaları nəzərə çarpır.

**Məsələn,** cümlənin əvvəlində tələffüz tempi 126 m/san olduğu halda sonda bu göstərici 62 m/ san-yə qədər zəifləyir. Cümlədə intensivlik zirvəsi başlanğıc fazada qeydə alınmışdır 8, 8 db.

İngilis dilindən seçilən **/ The redhair woman / got me up //** cümləsinin əvvəlində ton tezliyi sona doğru enmişdir. Cümlənin sonuna doğru intensivlik zəifləmələrlə müşayiət olunur. Cümlədə zaman qiymətləri də digər parametrlərdə olduğu kimi azalmalarla müşayiət olunur. Minimum zaman sərfi cümlənin sonunda qeydə alınmışdır. Təhlil olunan cümlədə akustik parametrlərin orta göstəriciləri variativdir (Qazıyeva, 2010: 191-195).

Qeyd etmək lazımdır ki, qeyri-müəyyən şəxsli cümlələrin sonda göstərdiyi akustik göstəricilər onun cümlənin əvvəlində və ortasındakı qiymətlərindən xeyli aşağıdı. Buna həmin qiymətləri tutuşdurduqda əmin olmaq mümkündür.Müəyyən məna çalarlarının verilməsində məqsəddən asılı olaraq, müxtəlif mövqeyə malik olması **"to get"** tərkibli frazeoloji vahidlərin intonasiya xüsusiyyətlərində özünü göstərir. Bu tərkiblərin xüsusiləşməsində onların izahedici sözlər hesabına genişlənməsi, bir məna ayrılığı təşkil etməsi və xüsusi intonasiya ilə deyilməsi böyük rol oynayır. **"To get"** tərkibli frazeoloji vahidlərdə bəzən sözün mənası arasında fərq kontekst baxımdan neytral olur.

Məsələn: **"buy" və "get"** sözləri ümumiyyətlə sinonim kimi götürülməyə bilər.

Lakin onlar aşağıdakı nümunədə sinonim sayılırlar.

Məsələn: **I'll go to the shop and buy some bread-**

**I'll go to the shop and get some bread** (Dükana gedib çörək alacağam).

Göründüyü kimi, alınan nəticələr göstərir ki, sintaqmın tərkibinə daxil olan **"to get**" tərkibli frazeoloji vahidlərin öz xüsusi leksik-semantik çəkiləri prosodik ünsürlərin nisbi dinamikliyi ilə realizə

edilir. Prosodik vasitələrin köməyilə cümlələrdə müxtəlif semantik sıcrayışlar baş verir. Beləliklə, hər bir vahid, eləcə də frazeoloji vahidlər mətnin tamlığına xidmət edir.

## Nəticə

1. Frazeoloji birləşmələrin nitq prosesində yaranması, başqa sözlə, onların dilə deyil, daha çox nitqə aid olması fikrinin təsdiqi linqvistik nöqteyi-nəzərdən önəmli əhəmiyyət kəsb edir.

2. İngilis və Azərbaycan dillərində sözlərin məna strukturları bir-birindən əhəmiyyətli dərəcədə fərqləndiyinə görə, dillərarası və dildaxili interferensiya burada nəzərə alınmalıdır.

3. Frazeoloji birləşmələrin tədrisinin və öyrənilməsinin ilkin psixoloji şərtləri qismində aşağıdakıları bilmək lazımdır:

a) anlayışın məzmun və həcminin müəyyənləşdirilməsi;

b) anlayışların məzmunu arasında məna əlaqələrinin yaradılması çıxış edir.

4. Sözü gedən psixoloji mexanizmin hazırlanması vacibdir.

5. Sözlərin birləşmə imkanları dedikdə onların birləşmə imkanları və söz birləşməsi məfhumunun linqvistik təbiətini əlində əsas götürən çətinlik kateqoriyalarının təqdim etdiyi söz birləşmələrini tədqiq etməkdir.

6. Hər bir vahid mətnin tamlığına xidmət edir. Özünəməxsus performansı ilə mövqeyini və hüququnu müəyyənləşdirir.

## Ədəbiyyat

1. Vygotsky, L. (1934). Thinking and speech. State. Social economy publishing house 362 p.
2. Talyzina, N. (1975). Management of the learning process. Publishing House of Moscow State University, 344 p.
3. Bogin, G. (1967). On the difficulties of using foreign language vocabulary and overcoming them. Psychology in teaching a foreign language, pp.122-136
4. Axundov, A. (2006). Ümumi dilçilik. Bakı: Şərq-Qərb. 280s.
5. Folomkina, S. (1959). To the question of the methodology of work on vocabulary, subject to productive assimilation in the 1st and 2nd courses of the institutes of foreign languages. Uchen. app. MSPIIA. M., t. XXII, p. 81-110.
6. Aidarova, L. (1964). Formation of a linguistic attitude to the word in younger students. Questions of psychology. No. 5, p.55-72
7. Making It All Right. (1978). Modern English Short Stories. Progress Publishers, Moscow, 457 p.
8. Qazıyeva, M. (2010). Xarici dilin tədrisində nitq ünsiyyəti üçün vacib olan psixoloji xüsusiyyətlər. Mədəniyyətlərarası dialoq: linqvistik, pedaqoji və ədəbi aspektlər. Beynəlxalq elmi konfransın materialları. Bakı: Mütərcim, s. 191-195.

Göndərildi: 17.02.2021 Qəbul edildi: 06.04.2021

DOI: 10.36719/2706-6185/03/29-32

**Əli Umud oğlu Əliyev**
Azərbaycan Dövlət Pedaqoji Universiteti Ağcabədi filialı
filologiya üzrə fəlsəfə doktoru
eli.eliyev.54@mail.ru

# ŞUŞA VƏ ŞUŞALILAR. REALLIĞA ƏSASLANAN TARİXİ HƏQİQƏTLƏR

**Xülasə**

Tarixən Qarabağın paytaxtı qədim Şuşa şəhəri olub. Şuşa əraziləri Azərbaycanın tarixi torpaqlarının - Midiya dövlətinin, Qafqaz Albaniyasının bir hissəsidir. Azərbaycanda ilk ibtidai insan məskənləri Qarabağ bölgəsində olmuşdur. Azıx, Tağlar və Zar mağaraları bunu tarixi sübut kimi sübut edir. Deməli, Şuşa həm də ən qədim yaşayış məskənidir. Bu adın mənşəyi haqqında müxtəlif fikirlər var. Buradan belə nəticəyə gəlmək olar ki, Qarabağda yaradılmış Şuşa şəhərinin yerinin seçilməsi də ənənəvi “yüksəklik”lə bağlı olub. Ona görə də Şuşa şəhəri Şuşa etnosu tərəfindən seçilərək uca bir yerdə salındığına görə Şuşa adlandırılmışdır.

***Açar sözlər:*** *Şuşa, Azərbaycanın incisi, Mədəniyyət Mərkəzi, Şuşa etnosu, Suz, Suziana, Şuşanik, Ər Şuşa, Şuşa yazıları, Şavşad, Şuşalə, Elam mədəniyyəti, Elamın Şuşa nəsli, Şuşa etnosunun dili*

**Ali Umud Aliyev**
Azerbaijan State Pedagogical University Aghjabadi branch
PhD in Philology
eli.eliyev.54@mail.ru

## Shusha and shushalı people. Historical truths based on reality

**Abstract**

Historically, the capital of Karabakh was the ancient city of Shusha. The territories of Shusha are part of the historical lands of Azerbaijan - the Median state, Caucasian Albania. The first primitive human settlements in Azerbaijan were in the Karabakh region. The Azykh, Taglar and Zar caves prove this as historical evidence. So, Shusha is also the oldest settlement. There are various opinions about the origin of this name. It can be concluded that the choice of the location of the city of Shusha, which was established in Karabakh, was also associated with the traditional "height". That is why the city of Shusha was named Shusha because it was chosen by the Shusha ethnos and built on a high place.

***Keywords****: Shusha, Pearl of Azerbaijan, Cultural Center, Shusha ethnos, Suz, Suziana, Shushanik, Er Shusha, Shusha inscriptions, Shavshad, Shushala, Elam culture, Shusha generation of Elam, language of Shusha ethnos*

## Giriş

Bu mövzunun aktuallığı ondadır ki, elmi-nəzəri ədəbiyyatda Şuşa və şuşalılar haqqında çox az məlumatlar vardır. Verilən məlumatların əksəriyyəti də xalq etimalogiyasına əsasən verilir. Ona görə də elmi araşdırmanın vacibliyi önəm kəsb edir.

Mövzunun aktuallığının başqa bir tərəfində isə Şuşanın 8 Noyabr 2020-ci il tarixdə işğaldan azad olunması ilə bağlı Azərbaycan Respublikasının Prezidenti İlham Heydər oğlu Əliyevin Şuşanı Azərbaycanın incisi və Mədəniyyət Mərkəzi elan etməsidir.

Firidun Şuşinski “Şuşa” kitabının “Qafqazın konservatoriyası” bölümündə Şuşa haqqında yazmışdır: “Şuşa şəhəri böyük ədəbi mərkəz kimi bütün azərbaycanda şöhrət tapmışdır. Öz doğma vətəni olan Şuşanın ab-havasının şairanəliyindən və gözəl mənzərəsindən ilham alan məşhur ədəbiyyatşünas Firidun bəy Köçərli Şuşanı Zaqafqaziyanın Şirazı adlandıraraq yazmışdır:

...Şuşa şəhərinin ab-havasının təsirindən və torpağının bərəkətindən burada çox zürəfa, üdəba və şüəra vücuda gəlibdir. Belə ki, Şuşa qalası Zaqafqaziyanın Şirazi mənzərəsində olub ərbabi-zövqü səfa oymağı və əhli-hal və sahibi-dil yatağı hesab olunur” (Köçərli, 157).

Göründüyü kimi Şuşa "Qfqazın konservatoriyası", "Zaqafqaziyanın Şirazı", "ərbabi-zövqü səfa oymağı" adlandırılır.

"Şuşanın inzibati mərkəzi olması, onun iqtisadi cəhətdən yaxşı inkişaf etməsi, həm də bu şəhərin füsunkar təbiəti və coğrafi mövqeyi buranın uzun müddət Azərbaycanın elm, poeziya, xüsusilə, musiqi mədəniyyəti mərkəzi olmasına böyük təsir göstərmişdir" (Şuşinski, 1998: 114).

Həqiqətən, tarixən Qarabağın paytaxtı qədim Şuşa şəhəri olmuşdur. Şuşa şəhərinin əraziləri tarixi Azərbaycan torpaqlarının – Midiya dövlətinin, Qafqaz Albaniyasının ərazi vahidinə daxildir. Azərbaycanda ilk ibtidai insan məskənləri Qarabağ bölgəsində olmuşdur. Azıx, Tağlar və Zar mağaraları tarixi dəlil kimi bunu sübut edir. Demək, Şuşa da ən qədim yaşayış məskəni olmuşdur. Bu adın mənşəyi haqqında müxtəlif fikirlər söylənilir. Elmi-nəzəri fikirdə qeyd olunur ki, eramızın II əsrində yaşamış qədim Roma tarixşisi Tasit Korneli Qafqaz ərazisində Dondar Türk tayfasına məxsus Sosu (Latın dilində "ş" səsi olmadığına görə "s" ilə yazılır) şəhəri haqqında məlumat vermişdir. Demək, Şuşa şəhəri ən qədim dövrlərdən mövcud olmuşdur. Təbii ki, bu şəhəri salan şuşalıların adı ilə şəhər Şuşa adlanmışdır. Şuşa qalası qədim yaşayış məskəninin yerində 1752-ci ildə Pənahəli xan tərəfindən Şuşa qalası inşa edilmişdir. Qala əvvəlcə "Pənahabad", sonra sadəcə olaraq "Qala", daha sonralar isə qədim adı ilə "Şuşa" adlandırılmışdır. Arxeoloqlar Şuşa qalasının yerində qədim yaşayış məskəni olduğu, həmin şəhərin XIII əsrdə monqolların basqını nəticəsində dağıldığını müəyyən etmişlər. "Şuşa "mağarası" Cıdır düzünün altında yerləşir. Mağaranın uzunluğu 25 metr, eni 20 metr, hündürlüyü 10 metrdir. 1976-cı ildə mağarada aparılmış qazıntı işləri zamanı eramızdan əvvəl VII-IV əsrlərə aid arxeoloji materiallar tapılmışdır" (Qarabağ, 2010: 36). Bir daha aydın olur ki, Şuşanın tarixi çox qədim dövrlərlə səsləşir. Təbii ki, Şuşanın relyefinə görə havası saf, təmiz, şəffaf və şüşə kimi büllurdur. Həmçinin şəhər şiş qayalı (şişə) hündür bir yerdə salınmışdır. Bütün bunlar Şuşa adının mənşəyini izah etmir. Şuşa şəhəri şuşalılar tərəfindən salındığına görə Şuşa adlandırılmışdır. "Adın izləri ilə hansı məkanda rastlaşırıqsa, deməli, orada həmin etnosun izi vardır. Məsələn, şumerlərdəki Kiş, Laqaş, Dilmun, Şərur, Susa adlarının Azərbaycan ərazilərində qarşılıqlarına misal olaraq Şəkidə Kiş kəndini, İsmayıllıda Lahıc, Ağsuda Dilman, Naxçıvanda Şərur, Qarabağda Şuşa adlarını göstərmək kifayətdir" (Hüseynli, Məmmədova, 2012: 31). Demək, Şuşa adı Şumerlərlə də səsləşir və öz qədimliyini ortaya qoyur.

Şuşa və şuşalılar haqqında Fərhad Külünglü, zəhmətkeş tədqiqatçı alimimiz İlhami Yusif oğlu Cəfərsoy elmi araşdırmalar nəticəsində öz elmi axtarışlarını tarixi dəlillər əsasında açıqlamışdır. 2005-ci ildə çap olunmuş "Sibirdə Təbriz şəhəri" kitabında yazmışdır: "Xristianlığın Albaniyada və İberiyada yayılmasına dayaq olanlardan biri də Şuşa tayfa başçıları idi. Onların adı əski tarixi qaynaqlarda Şuşa-Şuşu-Şüşülü deyimlərində qeyd olunur. Şuşa tayfa başçılarının ən adlı-sanlısı Ər Şuşadır. O, İberiya valisi idi. Mesrop Maştos qarqarların yanından qayıdanda onu Loriyə-öz sarayına dəvət etdi. İberlər yeni əlifbanı mənimsəyib, İncili öz dillərinə tərcümə etdilər.

Artıq IV əsrin ortalarında Şuşa Qafqazın güclü etnoslarından biri idi. Alban sarayında onların mövqeyi ilə hesablaşırdılar. Ər Şuşanın qızı Şuşanuk Alban şahının baş xatunu idi. Musa Kaqan Kaytuklu onu "Albaniyanın birinci xanımı" kimi tərifləyir (Alban tarixi, 1993: 58-59).

Şuşanik şah xatununun soy adıdır. Şuşanik "Ər Şuşanın" qızı deməkdir. Necə ki, qədim Romada Yuli Sezarın qızı Yuliana adı daşıyırdı...

İberiyanın hakim nəsli olan Şuşa uzun zaman siyasi meydandan yox olmadı. Albaniyanın etnik və mədəni həyatında iştirak etdi. Türk səyyahı Övliya Çələbi (1611-1685) onlar haqqında maraqlı bilgi verir. Yazır ki, Şəki qalasını Gürcüstanın Şuşalı melikləri tikdirmişdir.

Gürcü salnamələrində onların adı Şuşalo kimi göstərilir. Övliya Çələbi bu etnik adı Şuşalə şəklində təqdim etdiyindən o, uzun zaman tədqiqatçıların diqqətini cəlb etməmişdir.

Şuçalılar XVIII əsrə qədər Gürcüstanın tarixindən silinib getməmişlər. Ər Şuşanın baş qalasının xarabalıqları elə Şuşa adı ilə 1727-ci il sənədlərində göstərilmişdir (Budaqov, Qeybullayev, 2002: 14).

Hələ vaxtilə Həmdullah Qəzvini yazırdı ki, saklabların (slavyanların) ölkəsində Şuşa adlı şəhər var. Deməli, Şuşalıların hamısı Albaniyaya köçməyib. Onlar öz soydaşları olan Tiver türklərinə qoşulmuş, Dnestr çayı boyunda knyazlıq yaratmışlar. Tiver ölkəsində olan Şuşanay şəhərini salmışlar" (Cəfərsoy, 2005: 27-30).

Buradan aydın olur ki, Şuşa tayfası Albaniyaya saklabların ölkəsindən gəlmişdir. Həmçinin Şuşa tayfası Dnestr çayı sahilində knyazlıq yaratmış, Tiver ölkəsində Şuşanay şəhərini salmışlar. İlhami

Cəfərsoy Şuşa və şuşalılar haqqında öz elmi araşdırmalarını davam etdirmiş, "İber və H-ay folklorunda Türk mifik təfəkkürünün izləri" kitabında daha müfəssəl məlumatlar vermişdir: "Albaniya tarixində 2 Şuşanik olmuşdur. Onun birincisi Parfiya mənşəli Albaniya çarı Mömin Vaçaqanın arvadı (Alabniya tarixi 1993: 58-59), ikincisi Lori hakimi Ər Şuşanın (Alabniya tarixi, 1993: 33; Yeghishe, 1971: 10; Patkanov, 1883: 259) gəlini idi. Musa Kaqankatuklu birinci Şuşaniki "Albaniyanın xanım sahibəsi" adlandırır. Deməli, Şuşanik yalnız çarın xanımı deyildi. Ərinin əlində cəmlədiyi hakimiyyətə ortaq idi. Belə olmasaydı, o, ata evində daşıdığı Şuşanik, yəni Şuşa nəslindən olan soyadını saxlaya bilməzdi.

Şuşa nəslinin qızları öz insani keyfiyyətləri ilə ad çıxarmışdılar. Musa Kaqankatuklu yazır ki, Şuşanik sarayda yetimlər üçün şahanə süfrə açdırardı. Yetimlər yeyib doymayınca o, əlini çörəyə uzatmazdı (Bunu oxuyanda Xan qızı Natəvanın kasıblara yardım etməsi, ac qarınları doyurtması yada düşür – Ə.Ə.).

Xiristian kilsə salnamələrində Şuşa nəslinin patriarxlarının adı Ar Şuşa kimi yazıya alınmışdır. İberiyanın siyasi tarixində bir yox, iki Ər Şuşa olmuşdur. Birinci Ər Şuşa xristian deyildi. İkinci isə Şuşanikin qayınatasıdır. Onun dəvəti ilə Mesrop Maştos Lori dərəsindəki Şuşa qalasına gəlmiş və iberlər üçün əlifba tərtib etmişdir (Albaniya tarixi, 1993: 33). Deməli, iberlər üçün əlifba yaratdıran, "İncili" yerli kilsə dilinə tərcümə etdirən Ər Şuşa olmuşdur. Bu, Şuşa nəslinin tarixi xidməti kimi dərsliklərə daxil edilməlidir. Bilinməlidir ki, Ön Asiyada hər üç səmavi dinin yayılmasında türk xalqlarının danılmaz rolu olmuşdur. Bu barədə mən müəyyən düşüncələrimi elmi ictimaiyyətə bildirmişəm (Cəfərsoy, 2012: 49-55).

Şuşa qədim dünyanın ən şöhrətli nəsillərindən biri idi. Şuşanın kahin və cəngavər nəsilləri Elamın zəngin mədəniyyətini və dövlətçiliyini yaratmışlar. e.ö. II minilliyin əvvələrində 50-km lik su kanalı çəkdirmiş, 50 hektarlıq sahədə böyük şəhər salmışdılar. Şuşalılar Elam xətti yazılarının yaradıcılarıdır. Onlar dünyanın ən inkişaf etmiş xalqlarından biri kimi 3-4 min il bundan qabaq kənd təsərrüfatında borc-kredit sistemi tədbiq edirdilər (Yusifov, 1968: 219-227; Hinz, 1987: 6-160).

Elamın əhəmənilər tərəfindən işğalından sonra Şuşa cəngavərlərinin sağ qalan dəstələri İberiyaya köçdülər. Herodotun yazdığına görə (Chopin, 1866: 215), Şumer dilinə yaxın bir dildə danışan şuşalıların (Ragozina, 1903: 311) İberiyaya miqrasiyası əhəmənilərin dövründə baş vermişdir.

Şuşalıların Elamda qalan nəsilləri inanılmaz bir fədakarlıqla əhəmənilərlə vuruşa-vuruşa üç şəhərdə Xəzinədarlar dövlətini qurdular. Makedonyalı İsgəndər xəzinədarların əhəmənilərə qarşı qəhrəman mübarizəsini nəzərə alaraq onların dövlət başçılarını hakimiyyətdə saxladı (Fazili, 1970: 78).

Bu günədək biz Şuşa qalasının tarixini öyrənməmişik. Şuşa nəslinin yaratdığı dövlət və mədəniyyət isə tədqiqat obyetkinə çevrilməmişdir. Bunun üçün ilk öncə Elamın Şuşa nəslinin etnik mənsubuyyətini müəyyən etməli, onların hansı dildə danışdıqlarını öyrənməliyik.

Z.A.Raqozina yazır ki, Suz və Şuşa eyni şəhərlərdir (Ragozina, 1902: 495-497). Şuşa Suzun əsil adıdır, *Suziana* yunancadır (Ragozina, 1903: 298).

B.A.Turayeva görə, Elamın paytaxtı və yerli Şuşinak kultunun mərkəzi *Şuşa* şəhəri olmuşdur (Turaev, 1913: 79). Henrix Oretsin fikrincə, şəhərin adı Suz yox, *Suzadır* (Greece, 1907: 3). Kvinta Kursiya belə hesab edir ki, indi Xuzistan adlanan ölkənin qədimdə adı *Suza* olmuşdur (Curtius, 1750: 521). V.İ.Masson yazır ki, Suziana ölkənin yerli dildə yox, antik mənbələrdəki adıdır.

E.ö. 640-cı ildə bir assur kitabəsində Suz Şuşa adlandırılır. Kitabədə çarın dilindən deyilir: - Mənim əsgərlərim düşmənin cəsədlərini Şuşanın çöllərinə səpələdilər (Yusifov, 1968: 326). Y.Yusifov Elamın sosial-iqtisadi həyatına həsr ettiyi kitabında Şuşa ölkə adının izahını vermir. Öz qeydində sadəcə olaraq bildirir ki, Assuriya hökmdarı Şuşa deyəndə Xuzistanı nəzərdə tutmuşdur.

Sasanilərin zamanında da Suz şəhəri Şuşa adlanırdı. Əbu Osman Cahiz əl-Bəsri Xosrov Pərvizin zamanında yaşamış Səhm b. Səfran ət-Tirmizidən belə bir sitad verir: -Biz onların nə üçün Mədain və *Şuşada* zeytun ağacları əkdiklərini bilirik (Cahiz, 2001: 55).

Yeddi təpədən tapılan bir Elam xətti yazısında da Suz Şuşa adlandırılır. Ancaq bəzi tədqiqatçılar onu Şuşe, bəziləri Şuşi kimi oxuyurlar (Khranovsky, 2010: 135).

Şuşa yazılarının dili XIX əsrin ortalarından Avropa tədqiqatçılarının diqqətini cəlb etmişdir. Alman alimi F.H.Vaysbax Bisütun qaya yazılarının 3-cü mətninə istinadən belə bir nəticəyə gəldi ki, Şuşa kitabələrinin dili türk dillərinə qohum olmuşdur (Veissbach, 1890: 3-241). Z.A.Raqozina belə hesab

edir ki, həmin kitabənin dili Şumer dilinə yaxın olub, qeyri-ari və qeyri-sami mənşəlidir, geneoloji cəhətdən Turan dillərindən biridir (Ragozina, 1903: 311-318).

Sonra N.Y. Marr Şuşa yazıları üzərində tədqiqatlarını davam etdirdi. 1914-cü ildə Rusiyada və 1920-ci ildə Almaniyada nəşr etdirdiyi kitablarında Şuşa-türk etnolinqvistik bağlarına toxunmasa da, bildirdi ki, 2-ci dərəcəli Əhəməni yazılarının dili Yafəs dillərinə qohumdur (Mapp, 1920: 3-241; Mapp, 1914: 2-44). Biz bu istiqamətdə tədqiqatları davam etdirməli, Şumer-Şuşa-türk etnolinqvistik bağlarını sübuta yetdirməliyik.

Şuşa kitabələrinin dilində elə sözlər var ki, onların türk mənşəyini sübut etməyə ehtiyac yoxdur. Məsələn: onlar yerə *zer,* əkin yerinə *zer eklu,* sulanan əkin yerinə *su zer eklu* deyirdilər.

Ər Şuşanın və oğlu Bars xanın ölümündən sonra şuşalılar İberiyada və Aranda hakimiyyətdən uzaqlaşsalar da, uzun zaman bir etnik toplum kimi mövcud oldular. Onların xristian hissəsi Şuşa qalasının işğalından sonra İberiyadan Türkiyəyə köçdülər və Batum şəhərinin şimal-qərbində yurd saldılar. İndi onlar özlərini Şavşad adlandırır və babalarının bir vaxt İberiyadan köçüb gəldiklərini bilirlər. N.Y.Marr 1911-ci ildə Şavşetidə olmuş və görmüşdü ki, onların çoxu gürcücə danışa bilmir (Mapp, 1911: 5-27). Övliya Çələbi ( XVII əsr) onların ölkəsini Şavşeti yok, Şuşalə məlikliyi (Çəmənzəminli, 1993: 25) adlandırır.

Şuşalıların ən döyüşkən dəstələri İberiyada yarıköçəri bir el olaraq qaldılar. "Dəftəri-müfəssəli-Tiflis"də göstərilir ki, Şuşalu camaatının Qarayazı çölündə qışlağı vardır.

Şuşalıların cəsur bir elat kimi son döyüşlərindən biri XIV əsrin ortalarında olmuşdur. *Şuşa bəy* və Borçalı bəylə birlikdə Misir məmlük sultanının qardaşı, Hələb valisi əmir Yaşbəy ilə vuruşmuşdu (Sümər, 1992: 230). O, Yaşbəy ki, din xadimlərinin fitvası ilə 1417-ci ildə Nəsiminin dərisini soydurmuşdur" (Cəfərsoy, 2014: 62-65).

Buradan məlum olur ki, tədqiqatçı alim İlhami Yusif oğlu Cəfərsoy Şuşa və şuşalılar haqqında bir çox qaranlıq məqamlara aydınlıq gətirmiş, doğru, dəqiq məlumatları elmi ictimaiyyata çatdırmışdır.

Həmçinin məlum olmuşdur ki, *Suz, Xuzistan **elə*** Şuşadır. Şuşalılar isə Elamın Şuşa nəslindəndir, Elamın mədəniyyətini və dövlətçiliyini yaratmışlar.Türkiyədəki Şuşa folklorundan nümunələrə diqqət yetirdikdə görürük ki, şeirlərin dili türk dili, ruhu türk ruhudur:

Armudu dersun, yersun,
Kabuqini neylersun?
El saladum, qelmadun,
Neçun yalani dersun?

Yaxud:

Çıxar, baxçada qezarsen,
Derdli bağrımı ezarsen.
Beyaz kağıza benzarsen,
Kelem tutmaz yazam seni.

Akademik N.Y.Marr XX əsrin əvvəllərində gürcülərin Şuşeti adlandırdıqları Şuşa mahalında folklor nümunələri toplamışdır. Gürcü hərfləri ilə yazılmış həmin nümunələr türkcədir:

Çıxartum a kuzları,
Tapan etdi düzlari.
Salam verdim, almadi,
A bu köyün kızlari.

Şuşa bəyləri Suriyadan qayıdandan sonra Araz çayının sol sahilində indiki Cəbrayıl rayonu ərazisində yurd saldılar. Onlar Aran Qarabağında qışlayır, yayda Kirs, Sarıbaba dağlarının ətəyinə köçürdülər. Oturaq həyata keçəndən sonra onlar Şuşa kəndlərini və Şuşa şəhərini saldılar.

## Nəticə

Elmi nəzəri fikirdə belə bir məlumat da var ki, Şumerlər Elam ölkəsini "Nim" ("yüksək ölkə") adlandırmış, qədim fars mənbələri isə bunu "Uvca" ("Uca") adlandırmışlar. O da qeyd olunur ki, Xuzistan adı hozi sözündən yaranmışdır. Mənası "yüksək, uca yer" deməkdir. Belə nəticəyə gəlmək olur ki, Qarabağda bünövrəsi qoyulan Şuşa şəhərinin yerinin seçilməsi də ənənəvi "yüksəklik, ucalıqla" bağlı olmuşdur. Odur ki, Şuşa şəhəri həm Şuşa etnosu tərəfindən, həm də uca, hündür bir yerdə seçim edilərək tikildiyinə görə Şuşa adlanmışdır (Azərbaycan toponimlərinin ensiklopedik lüğəti, 2007).

## Ədəbiyyat

1. Köçərli, F. (1978). Azərbaycan ədəbiyyatı, Bakı.
2. Şuşinski, F. (1998). Şuşa, Bakı.
3. Qarabağ (Yaddaş). (2010). Bakı.
4. Hüseynli, N., Məmmədova, L. (2012). Türk dillərinin genologiyası: Şumer və Türk leksik paralelləri, Bakı.
5. Cəfərsoy, İ. (2005). Sibirdə Təbriz şəhəri, Bakı.
6. Cəfərsoy, İ. (2014). İber və H-ay folklorunda Türk mifik təfəkkürünün izləri, Bakı.
7. Azərbaycan toponimlərinin ensiklopedik lüğəti, ikinci cild. (2007). Bakı.
8. https://files.preslib.az/projects/shusha/az/e2.pdf.

Göndərildi: 03.01.2021 Qəbul edildi: 19.03.2021

DOI: 10.36719/2706-6185/03/34-38

**Jamila Rashadat Majidli**
Baku State University
master student
majidlijamila@gmail.com

# NEW OPPORTUNITIES AND UNRESOLVED ISSUES IN THE CONTEXT OF CONVENTION ON THE LEGAL STATUS OF THE CASPIAN SEA

**Abstract**

This article is dedicated for the analysis of the Convention on 'Legal Status of the Caspian Sea' concluded on August 12th, 2018 between the coastal States of the Caspian Sea. The exclusive rights and new opportunities issued to the parties, and alternative resolution to the question 'sea or lake' which has been getting on international dispute are researched throughout the Article. However, some issues arisen before the Convention have not been resolved yet. The research states possible solutions for these issues and clarifies indefinite circumstances not reflected in the Convention. In this paper, contradictions existing within the provisions of the Convention and discrepancies occurred between the clauses and the practice are searched. This Article has been prepared on the basis of the analysis of the articles of the Convention on 'Legal Status of the Caspian Sea' and the comparison of the current situation with the United Nations Convention on the Law of the Sea (UNCLOS-1982).
***Keywords:*** *Caspian Sea, special legal status, international disputes, delimitation, implementation of the strategical projects*

**Cəmilə Rəşadət qızı Məcidli**
Bakı Dövlət Universiteti
magistrant
majidlijamila@gmail.com

## Yeni imkanlar və həll edilməyən məsələlər Xəzər dənizinin hüquqi statusu haqqında konvensiyasının

**Xülasə**

Bu məqalə Xəzər dənizinin sahilyanı dövlətləri arasında 2018-ci il avqustun 12-də bağlanmış "Xəzər dənizinin hüquqi statusu haqqında" Konvensiyanın təhlilinə həsr olunub. Maddə boyu tərəflərə verilən müstəsna hüquqlar və yeni imkanlar, beynəlxalq mübahisəyə səbəb olan "dəniz və ya göl" məsələsinin alternativ həlli araşdırılır. Lakin Konvensiyaya qədər yaranmış bəzi məsələlər hələ də öz həllini tapmayıb. Tədqiqat bu məsələlərin mümkün həll yollarını bildirir və Konvensiyada əks olunmayan qeyri-müəyyən halları aydınlaşdırır. Bu yazıda Konvensiyanın müddəaları daxilində mövcud olan ziddiyyətlər və müddəalar ilə təcrübə arasında yaranan uyğunsuzluqlar araşdırılır. Bu məqalə "Xəzər dənizinin hüquqi statusu" haqqında Konvensiyanın maddələrinin təhlili və hazırkı vəziyyətin Birləşmiş Millətlər Təşkilatının Dəniz Hüququ Konvensiyası ilə müqayisəsi (UNCLOS-1982) əsasında hazırlanmışdır.
***Açar sözlər:*** *Xəzər dənizi, xüsusi hüquqi status, beynəlxalq mübahisələr, delimitasiya, strateji layihələrin həyata keçirilməsi*

## Introduction

The Caspian Sea has attracted the interest of the states as a political, geographical, and strategical important sea basin for centuries. The Caspian Sea had been under the governance of the USSR and Iran until 1991, was divided between five coastal states after the collapse of the USSR. From this day, a lot of legal disputes concerning either littoral states, or entirely law occur. One of the basic problems was the 'a sea or a lake' question which is based on ancient roots. The answer to this question would

determine the legal status of the Caspian Sea and appoint a legal regime of it. This issue particularly, in the interest coastal states finally was solved after 22 years' discussions as a result of the conclusion of the Convention on the Legal Status of the Caspian Sea on 12th of August 2018, in Aktau, Kazakhstan. Although the legal regime to be applied to the Caspian Sea has been defined as well, still, some problems remain unsettled.

This paper analyses the difference of identified legal regime from the others, new opportunities established, unresolved and not-touched matters, completely the legal effect of the Convention to the legal-strategical order of the region. The issues to be analyzed under special titles by considering the points arising from the Convention vice versa, not-highlighted questions, and finally, main matters shall be perused within the Convention.

### 1. Legal Status

Besides the political-strategical significance of the Caspian Sea, the determination of the Caspian Sea is a sea or a lake was essential to construe the obligations of coastal states.

So that, five countries have not been able to reach a unanimous decision until the conclusion of this Convention, many issues remain unsettled from the demarcation of maritime borders to implementation of projects in the seabed. Because each time doubtless, one party put forward the impossibility of the operation to be realized by evaluating the legal status of Caspian Sea in favor of its own interest. As well as, identification of the legal status of the Caspian Sea was a necessary stage in the political-economic life of the region in resolving existing and potential disputes. Ultimately, 'Special legal status' has been issued to the Caspian Sea; despite the parties argued the Caspian Sea is a sea or a lake. As an unseen concept 'Special Legal Status' has deprived the Caspian Sea of either 'sea' or 'lake' status. Taking into consideration that some states wish to recognize the Caspian Sea as a sea and others as a lake, this status is in fact against own interests of each state. Such that, if the Caspian Sea was a lake, any legal mechanism would not exist, it would be divided in order to international customs and practice. This case would lead to an equal division of the Caspian Sea among states as a lake (20% of the territory to each state). The division on the base of equidistance principle was mostly in favor of Iran has the shortest coastline. The Caspian Sea which was governed by Iran and USSR on the base of the principle of the condominium (joint use) until 1991 and was clarified as a sea, which had to be recognized as a lake and divided equally among parties to comply with current interests of Iran. On the other hand, another way for delimitation of lakes in international practice (only as of the example of Titicaca Lake, Bolivia vs Peru) is having 12 nautical miles territorial sea by the littoral states and the rest of water-basin is in joint-use. (1) It was requested for the realization of the mentioned versions, to determine the legal status of the Caspian Sea and to choose how the legal regime would be applied (Janusz, 2005: 2). Those who wish to declare the Caspian Sea as a lake, claim that it cannot reach to the World Ocean naturally, and has no connection with other seas. However, the Caspian Sea, which has access to the world ocean through the Volga-Don and Volga-Baltic canals, increases claims supporting to define as a sea by possessing the features like geographical volume (76,700 cubic meters), depth (the deepest point in the south is 1,200 m in Lankaran, total depth of 1,025 m in the south), salinity and historical experience (3). If the Caspian Sea was a sea, the provisions of the United Nations Convention on Law of the Sea would be applied to the Caspian Sea directly. It establishes the rights of each coastal state same as the rights of each state has the access to the sea; territorial sea extending at most 12 nautical miles, contiguous zone up to 24 nautical miles, the right to claim an exclusive economic zone not exceeding 200 nautical-miles, the rights to obtaining continental shelf covers subsoil and seabed calculating from the baseline up to a limit not exceeding 200 nautical miles (United Nations Convention on the Law of the Sea (UNCLOS). 1982). After many-years discussions, it has been deemed unsuitable to the territory of the Caspian Sea to make a claim the exclusive economic zone by coastal states. This is one of the main reasons for not identifying the Caspian Sea as a sea. The Caspian Sea is divided into 15 nautical-miles wide territorial seas, fishery zone up to a limit not exceeding 10 nautical-miles, and common maritime space (The Convention on the Legal Status of the Caspian Sea, 2018). So, The Caspian Sea is not specified as a sea, and the littoral states are deprived of the claim on an exclusive economic zone and continental shelf. And what about the distribution of exclusive economic zone equally among the parties? Should the

Caspian Sea have the ‘sea status’ really? 122nd article of UNCLOS states that *"‘enclosed or semi-enclosed sea’ means a gulf, basin or sea surrounded by two or more States and connected to another sea or the ocean by a narrow outlet or consisting entirely or primarily of the territorial seas and exclusive economic zones of two or more coastal State."*




The Caspian Sea acts as the sea surrounded by two or more states and is connected to the World Ocean by a narrow outlet through the interpretation of this Article. Recognition of the Caspian Sea as a closed sea would give it the right to use the regime applied to the seas provided by UNCLOS. It also would procreate to the littoral states the rights to claim Exclusive economic zone and contiguous zone (LOSI Conference Papers, 2012: 7). With this, the parties would achieve the settlement of the delimitation issue of an exclusive economic zone between States with opposite or adjacent coasts (UNCLOS, art.74) with an agreement. Likewise, UNCLOS as the single legal mechanism of maritime law refers to the importance of the mutual agreement in the delimitation of the continental shelf between States with opposite or adjacent coasts (UNCLOS, art. 83)

In such circumstance when the Caspian Sea is conceded as an enclosed sea, the parties are not obliged to create 200 nautical-mile wide exclusive economic zone or continental shelf covering seabed, they also will be able to delimit exclusive economic zone or a continental shelf containing smaller area appropriately to the width and length of the Caspian Sea which appoints the state jurisdiction in subsoil and seabed in accordance with own interests of each state. (An example of the Baltic Sea, delimitation among Estonia, Finland, Latvia, Sweden, and Russia) (Maritime Delimitation in the Baltic Sea, 438).

But instead of this, the establishment of 10 nautical-mile wide fishery zone from the outer-limit of the territorial sea for the purpose of production of aquatic biological resources and providing states' fishing reserves, somehow replaces exclusive economic zone and is under sovereign rights of the states.

Still not fixed questions in the Convention are not marking out common maritime space and its limits are obscure.

## 2. Not-delimited spaces

According to the Convention, common maritime space is delineated from the outer limit of the fishery zone belonging to the littoral state. But it is not stipulated that to where common maritime space is extended. It is reflected in the main terms of the Convention that this space is in jointly use of all parties. By reason of the not reflecting any provision in the Convention concerning circumscribing of the common maritime space, it can be interpreted in literal meaning as jointly use of the parties in subsoil and seabed at common maritime space. It is possible to think due to this indeterminacy that the

